Poemanın bu müvəffəqiyyəti əsərdə dövrün ən mühüm problemlərinin əks olunması ilə bağlı idi. C.Q.Bayron bu poemada Böyük Fransız inqilabından sonra Avropada hökm sürən peşmançılıq, məyusluq əhval-ruhiyyəsini əks etmişdi. Bu əhval-ruhiyyə Fransa inqilabının azadlıq ideallarının puça çıxması ilə bağlı idi. Böyük Fransız inqilabının bayraqlarında həkk olunan "Azadlıq, Qardaşlıq, Bərabərlik" şuarları gerçəklikdə şəxsiyyətə təzyiq göstərməklə, siyasi terror və sonu görünməyən müharibələrə çevirilmişdi. Bu səbəbdən Avropada çaşqınlıq, təəssüf, qeyri-müəyyən ümidlər və eyni zamanda gələcəyə inamsızlıq hökm sürürdü. Belə ki, Bayronun poemasında da, Avropada yaşadığı mühit baş qəhrəman Haroldu qane etmir - o yad ölkədə, sehrli Şərqdə yaşamağı üstün tutur. Yeni dövrün, həyatın qaldırdığı əsas mövzu-insan şəxsiyyəti ilə cəmiyyətin qarşılıqlı münasibəti mövzusu-oxucular üçün həm aktual, həm də hamıya yaxın idi. Şair baş qəhrəmanını oxucuya poemanın ilk sətirlərindən təqdim edir. Bu kübar gənc artıq insanlardan, həyatın özündən küsərək, cəmiyyətdən uzaqlaşmaq istəyir. Onun qəlbi viran qalıb, o həyatından narazıdır, onun gözündə hər şey artıq mənasızdır. İnsana xas olan ən gözəl hisslərin heç biri-dostluq, məhəbbət, insanpərvərlik- onu özünə cəlb etmir. O tənhadır, o dərin ürək sıxıntısından əzab çəkir və bu dərin mənəvi əzabdan qurtarmaq üçün, Harold uzaq səyahətə yola düşür. İlk baxışdan Çayld-Harold soyuq və laqeyd insan görünür. Lakin onun soyuqluğu arxasında alovlu ürək gizlənir. Harold öz evindən, rahat, təminatlı həyat tərzindən uzaqlaşır və yeni həyat tapmaq arzusundadır. Haroldun vətəni ilə vidalaşması, onun yaşadığı cəmiyyətlə münaqişəsi romantik tərzdə təsvir olunur. Haroldun Şərqə üz tutması da təsadüfi deyil-romantik ədəbiyyatda bu üsuldan tez-tez istifadə edilirdi. Romantik qəhrəman yalnız Şərqdə özünü təsdiq edə bilərdi, çünki Şərq həyat tərzi, burada olan adət-ənənə romantik qəhrəmanın əhval-ruhiyyəsinə uyğun idi. Haroldun fərdiyyətçiliyi, tənhalığı poemada dönə-dönə vurğulanır. Harold mənfi qəhrəman deyil, o əsarət altında yaşayan xalqların halına acıyır və zülmkarlığa nifrət edir. Buna baxmayaraq, o milli hərəkatda iştirak etmir, heç bir fəaliyyətlə məşğul olmur. Tənhalıq, həsrət, ürək sıxıntısı-budur onun qisməti. Bununla yanaşı Haroldun şüurunda artıq müəyyən dönüş də müşahidə olunur: Bayron qeyd edir ki, Harold bəzən gəncliyinin mənasız keçdiyini özü-özünə etiraf edir. Məhz buna görə şair poemanın üçüncü fəslində açıq qeyd edir ki, Haroldun ən müsbət xüsusiyyətləri - haqsızlıqla barışmazlığı, zəkası, ağlı heç bir əməli işlə təsdiqlənmir. Harold-fərdiyyətçidir və bu xüsusiyyət onun "qəhrəmanlığını" şübhə altına alır. Haroldun surətində Bayron böyük ümumiləşdirilmiş obraz yaratmışdı. Harold öz dövrünün tipik qəhrəmanıdır. O yaşadığı dövrün mürtəce qanunlarına, Napoleon müharibələrinin törətdiyi fəlakətlərə qarşı etirazını ifadə edən şəxsdir. Əslində Harold oyanmaqda olan ictimai şüurun təmsilçisidir. Ənənəvi olaraq müsbət hesab edilən anlayışlar gəncin qəlbinə ağır yük kimi çökür. Harold köhnə ideallardan ayrılaraq yeni xəyalın, yeni məyusluğun ardınca gedir. Bu insan nə üçün yaşadığını bilmir, gələcəyə heç bir ümid bəsləmir. Əslində Harold böyük insan faciəsini yaşayır-onun həyatda heç bir marağı, məqsədi, ömrünün heç bir mənası yoxdur. Çayld-Harold obrazını təhlil edərkən çox mühüm bir məqam da qeyd edilməlidir. Bayronun yaratdığı romantik qəhrəmanlar arasında Harold bəlkə də ən passiv qəhrəmandır. İlk baxışdan bu hal ziddiyyətli görünə bilər, çünki Bayronun romantik qəhrəmanları son dərəcə fəaldırlar və heç bir qanunu, qaydanı kor-koranə qəbul etmək istəmirlər. Lakin burada heç bir ziddiyyət yoxdur, çünki Harold Bayronun ilk qəhrəmanıdır və sonrakı surətlər silsiləsi əlbəttə ki, ciddi təkamül yolu keçir. Həmin təkamül, inkişaf Bayronun "Çayld-Haroldun ziyarəti" poemasından sonra yaratdığı "Şərq poemaları" silsiləsində tam aydınlıqla izlənə bilər.

"Çayld-Haroldun ziyarəti" poemasında baş qəhrəman Bayronun özü ilə eyniləşdirildiyi halda, "Şərq poemaları"nın qəhrəmanlarında, müəllifin onlara münasibəti bir qədər fərqli idi. "Şərq poemaları"nın qəhrəmanlarının Bayronun özü ilə eyniləşdirilməsi, onların davranış qaydalarına birmənalı yanaşmaması İngilis cəmiyyətində müəllif üçün xoşagəlməz, hətta təhlükəli nəticə verə bilərdi. Buna görə Bayron özü hadisələrə, qəhrəmanlara qiymət vermir. Adətən bunu uydurulmuş hekayəçi edir, müəllif isə bir qədər arxa plana keçir. Buna baxmayaraq, müasirlərinin şüurunda "Şərq poemaları"nın müəllifi özgə xalqın həyatının müşahidəçisi deyil. O eyni zamanda Şərq həyatının dərinliyinə bələd olan və hansısa dramatik hadisələrdə iştirak etmiş bir şəxs idi. Bu şəxs həmin hadisələrdən yeni biliklər, yeni həyat təcrübəsi əldə etmişdi. Beləliklə, Bayronun şəxsiyyəti yenə də, yaratdığı surətlərlə əlaqələndirilir, eyniləşdirilir, nəhayət şair haqqında yalnış təsəvvür yaradırdı. Bayron heç vaxt Şərqdə yaşadığı dövrdə

özünün iştirak etdiyi hadisələr haqqında əsərlərində söhbət açmırdı. Nəticədə oxucu kütləsi istər-istəməz şairin mənəvi cəhətdən öz qəhrəmanına yaxın olmasını uydurur, onun qeyri-adi simasını yaradırdı.

Bayronun Yunanstanda milli azadlıq hərəkatında iştirak etməsi, onun həyatı, bədii axtarşları onun qəhrəmanlarının daxili aləmini anlamaq üçün həm də bir vasitə hesab oluna bilər. N.A.Dyakonova qeyd edir ki, "Şərq poemalarında qəhrəmanların şəxsi azadlığı heç nə ilə məhdudlaşmır. Ona görə də, şəxsi azadlıq siyasi azadlıqla sıx şəkildə birləşir, qəhrəman artıq düzgün qurulmamış cəmiyyətlə titanik mübarizəyə qalxırdı. Bu da öz növbəsində romantizmdə azadlıq konsepsiyasının özünə artıq tam yeni, ictimai-siyasi məna əlavə edirdi. "Avropa ədəbiyyatında Bayron qədər insan şəxsiyyyətinin azadlığını tərənnüm edən yazıçı bəlkə də yoxdur. İngilis şairinin fikrincə insanın azadlığı onun tənhalığı ilə nəticələndiyi halda belə, insan yenədə azadlığından imtina etməməli, daim ona can atmalıdır" (9, 7). Buna görə Bayronun Missolungidə vəfatı şairin əvvəlki imicini, simasını, cəmiyyətin ona münasibətini də köklü şəkildə dəyişmişdi. Bayron artıq təkcə "məğrurluq şairi" kimi deyil, əsl döyüşçü əsgər kimi xarakterizə edilirdi. Yəni, romantik şair Bayron öz təxəyyülünün, yaratdığı qəhrəmanlarının, ekzotik və maraqlı süjetlərin qulu deyildi. Bayron o zaman Balkan yarımadasında baş verən və əsasən Böyük Fransız inqilabının nəticəsi olan hadisələrin diqqətli və həssas müşahidəçisi və fəal iştirakçısı idi" (10,131).

Ümumiyyətlə, romantik qəhrəman məfhumu çox mürəkkəb bir məfhumdur. Hər bir ədəbi əsərdə baş qəhrəman həlledici rol oynayır. Romantik əsərdə isə baş qəhrəman öz spesifik xüsusiyyətlərinə malikdir. Həmin xüsusiyyətlərin başlıcası- romantik qəhrəmanın onu əhatə edən gerçəklikdən narazı olması, həmin gerçəkliyə qarşı açıq, kəskin etirazı, hətta onunla mübarizə aparmasıdır. Onu da qeyd etmək lazımdır ki, romantik etiraz ən müxtəlif formalarda ifadə edilə bilər- bəzi qəhrəmanlar reallıqla barışdığı halda, başqaları onunla daim mübarizə aparır, ona qarşı üsyan qaldırır. Bu fərq ingilis romantiklərinin yaradıcılığında daha qabarıq şəkildə nəzərə çarpır. Ingilis romantizmi heç vaxt monolit bir cərəyan olmamışdır. İngilis romantikləri iki qola-aktiv (fəal) və passiv romantiklərə bölünürdülər. Bayron və Şelli ingilis romantizminin aktiv qolunu, Bleyk, Vordsvort, Kolric isə - passiv qolunu təmsil edirdilər. Bayron özünün, ədəbiyyatda tam yeni olan insan konsepsiyasını yaratmışdı. Avropa romantizmində Bayron qədər insan şəxsiyyətinin "mütləqiyyətini" təsdiq edən, onu müdafiə edən ədib yox idi. Bayronun yaratdığı şəxsiyyət konsepsiyası Avropa humanist dünyagörüşününün, təfəkkürünün, inkişafının mühüm və məntiqi nəticəsi idi. Byron, ekzotik və tarixi şərtlərin şiddət və dramını istismar edən əsərlərlə bütöv Avropaya böyük bir şöhrət gətirdi. Qöthe Bayron haqqında deyirdi ki: "Şübhəsiz ki, o bizim əsrimizin ən böyük dahisidir" (11,215).

## Nəticə

Qeyd edildiyi kimi, romantiklər əvvəl mövcud olan qaydaları və normaları inkar edirdilər. Lakin romantiklər yalnız inkarla məhdudlaşmır, onlar özlərinin yeni, romantik norma və qaydalarını formalaşdırırdılar. Bu da tam məntiqi idi, çünki, əks halda romantizm müstəqil yaradıcılıq metodu və ədəbi cərəyan kimi inkişaf edə bilməzdi. Və burada yenə də mərkəzi yeri qəhrəman məfhumu tutur. Yuri Mann bu haqda belə qeyd edir: "Romantizmdə mərkəzi qəhrəmanın xüsusi mövqeyi bir sıra sabit məqamlarla-təsvir, süjet, kompozisiya və b. ilə təsbit olunur. Birinci məqam qəhrəmanın əsasən dörd elementdən ibarət olan xarici görünüşüdür ki, bu da müəyyən sabit cizgilərlə, məsələn yüksək alın, iti, məğrur baxış, üzünün qaşqabaqlı ifadəsi və bu kimi xüsusiyyətlərlə çatdırılır. Daha sonra romantik qəhrəman onu əhatə edən mühitə yadlaşır, ona özgələşir. Romantik qəhrəman dərin məhəbbətlə sevməyi bacarır. Nəhayət, sonuncu, əsas xüsusiyyət – romantik qəhrəman taleyin ona verdiyi sınaqlara tab gətirməyə, mətinliklə, mərdliklə sinə gərməyə qadirdir. Deyilənlərə əsaslanaraq "romantik qəhrəman" məfhumunu daha da konkretləşdirmək olar. Romantiklərin diqqət mərkəzində olan qəhrəman real gerçəkliyə ciddi təsir göstərməyə qadir olan, qeyri-adi bir şəxsiyyətdir. Erkən romantizmdə həmin qəhrəman qurub yaradan, tam, bütöv, nikbin bir insandır. Erkən romantizmin qəhrəmanı ziddiyyətlərdən azad olan mühitdə yaşayır. Yetkin dövrün romantik qəhrəmanı isə yaşadığı mühitə yadlaşmış, mühitlə barışmaz münaqişədə olan faciəvi şəxsdir" (12, 112).

Romantik qəhrəman özünün şəxsi düşüncələrinə, hisslərinə qapılmaqla kifayətlənmir. Romantik qəhrəman həmin hisslərin prizmasından bütün dünyanı görür. Tipikləşmənin bir vasitəsi olan

psixologizm hər bir xarakterin xüsusiyyətlərini müəyyən edir, bəzən isə onları şərtləndirirdi. Bayronun tipik romantik qəhrəmanları həyatdan küskün, məyus olmaqla, bütün dünyaya qarşı üsyan qaldırırdı.

**References**


1. Dr.Harko G. De Maar. A history of Modern English Romanticism. New York: 1970, 221 p.
2. Y.M.Lotman. On the content and structure of the concept of "artistic literature" (Selected article.). in 2 volumes. V.1. Tallinn: Alexandra, 1992, 472 p.
3. V. M.Zhirmunsky. Byron and Pushkin. M .: Nauka, 1978, 423 p.
4. David Duff .Romance and Revolution: Shelley and the Politics of a Genre.
5. Cambridge University Press, 1994, 276 p.
6. Simon Williams. Wagner and the romantic hero. New York: Cambridge
7. University Press, 2004, 193 p.
8. V.V. Vanslov. Aesthetics of romanticism. M .: Art, 1966, 403 p.
9. Poems & Poets viewed 12 May 2013.
10. McGann, Jerome. "Byron, George Gordon Noel (1788–1824)". Oxford
11. University Press,2004 , 319 p.
12. A.Sahhat Works. Baku: Lider Publishing House, 2005, 452 p.
13. N.Y.Dyakonova. London romantics and problems of English romanticism. L .:
14. LGU Publishing House, 1970, 232 p.
15. Rupert Christiansen. Romantic Affinities: Portraits From an Age, 1780-1830. London: Bodley Head, 1988, 215 p.
16. Y.B. Mann. Poetics of Russian Romanticism. M .: Nauka, 1976, 375 p.


Göndərilib: 01.12.2021 Qəbul edilib: 18.12.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/73/22-27

**Elnarə Adil qızı Məmmədova**
Azərbaycan Tibb Universiteti
filologiya üzrə fəlsəfə doktoru
ememmedova69@mail.ru

# M.KAŞĞARİNİN "DİVANÜ LUĞAT-İT TÜRK" ƏSƏRİNDƏ FEİLLƏR

**Xülasə**

Böyük türkoloq M.Kaşğari ərəb dilçilik məktəbinin nümayəndəsidir. Ərəb dilçiliyində geniş yayılmış ənənəyə görə lüğətlərdə adlarla feillər ayrı-ayrı təqdim olunur. M.Kaşğari də bu ənənəyə sadiq qalaraq "Divan"dakı feilləri ayrıca təqdim etmişdir.

Türk dillərinin canı feildir. Bütün nitq hissələrinə aid sözləri özündə ehtiva edən bu lüğətdə feillər xüsusi çəkiyə malikdir. Ona görə də abidədəki feilləri geniş öyrənmək, təhlil apararaq, tarixi inkişafına işıq salmaq qərarına gəldik.

M.Kaşğari "Divan"ındakı feillər təkcə Azərbaycan dilçiliyində deyil, eləcə də türkologiyada ilk dəfə leksik-qrammatik cəhətdən sistemli şəkildə tədqiq olunur.

Məqsədim müasir dildəki feillərin tarixi təkamülyolunu izləmək, feillərin yaranma imkanlarını müəyyənləşdirmək olmuşdur. Elə buna görə qədim türk dilinin geniş mənzərəsini özündə əks etdirən, dilimizin tarixi inkişafına işıq salan M.Kaşğari "Divan"dakı feilləri geniş təhlil etmək qərarına gəldik.

***Açar sözlər:*** *türk dilləri, leksik-semantik, dillərin fonetikası, müqayisəli qrammatika, feil yaradan şəkilçilər, tematik qruplar, morfoloji əlamətlər, sintaktik vəzifələr*

## The verbs in work of M.Kashgaris "Divani lugat it-turk"

**Summary**

The great turkologist M. Kashgari is a representative of the Arabic school of linguistics. According to a widespread tradition in Arabic linguistics, nouns and verbs are presented separately in dictionaries.

M.Kashgari, remaining faithful to this tradition, presented the verbs in "Divan" separately.

The soul of the Turkish language is the verb. In this dictionary, which contains words related to all parts of speech, verbs have a special weight. Therefore, we decided to study, analyze and shed light on the historical development of the verbs in the monument.

The verbs in M. Kashgari's "Divan" are systematically studied lexically and grammatically not only in Azerbaijani linguistics, but also in Turkology for the first time.

My goal was to follow the historical evolution of verbs in modern language, to determine the possibilities of verbs. That is why M. Kashgari, reflecting the wide picture of the ancient Turkic language and shedding light on the historical development of our language, decided to analyze the verbs in "Divan" in detail.

***Key words:*** *Turkish languages, lexical-semantic, phonetics of languages, comparative grammar, verb-forming suffixes, thematic groups, morphological features, syntactic tasks*

Türk xalqlarının ilk və möhtəşəm abidələrindən olan "Divanü lüğat-it-türk" əsəri türk xalqlarının tarixi, həyat tərzi etnoqrafiyası, milli-mənəvi dəyərləri haqqında ensiklopedik məxəzdir.

Məlum olduğu kimi böyük türkoloq M.Kaşğari ərəb dilçilik məktəbinin nümayəndəsidir. Ərəb dilçiliyində geniş yayılmış ənənəyə görə lüğətlərdə adlarla feillər ayrı-ayrı təqdim olunur. Orta türk dövründə bir çox əsərlərdə əl-Zəməxşarinin "Müqəddimətül ədəb", "Tərcüman" və s. bunun şahidi olduq. M.Kaşğari də bu yolla getmiş, feilləri ayrıca təqdim etmişdir.

M.Kaşğari "Divan"ındakı feillər təkcə Azərbaycan dilçiliyində deyil, eləcə də türkologiyada ilk dəfə leksik-qrammatik cəhətdən sistemli şəkildə tədqiq olunur. Ona görə də bu abidədəki feilləri geniş öyrənmək, təhlil aparmaq, tarixi inkişafına işıq salmaq qərarına gəldim.

Müasir dildəki feillərin tarixi təkamül yolunu izləmək, ikihecalı və daha çoxhecalı feillərin yaranma imkanlarını müəyyənləşdirmək, feil düzəldən şəkilçi morfemlərin tarixi inkişafını üzə çıxarmaq əsas məqsəd olmuşdur.

Məqsədim qədim türk dilinin geniş mənzərəsini özündə əks etdirən, dilimizin tarixi inkişafına işıq salan M.Kaşğari "Divan"ındakı feilləri geniş təhlil etmək, qədim türk dilinin o vaxtkı sistemində feillərin bir nitq hissəsi kimi mövqeyini müəyyənləşdirməkdir.

Bu məqsədə nail olmaq üçün feillərin leksik-semantik təsnifatını aparmaq, hansı feillərin istifadə baxımından daha üstün olduğunu müəyyənləşdirmək, "Divan"dakı feillərlə müasir Azərbaycan dilindəki feillərin əlaqəsini aşkar etmək, onların fonetik, qrammatik və leksik inkişaf istiqamətlərini müəyyənləşdirmək, feillərin quruluşca növünü araşdırmaq, feillərin yaranma yollarını aşkarlamaq, məhsuldar və qeyri-məhsuldar feil düzəldən şəkilçiləri müəyyənləşdirmək, feillərin qrammatik xüsusiyyətlərini dəqiqləşdirmək, xüsusilə növ, təsirlik, inkar, şəxs, təsriflənən və təsriflənməyən formaları nəzərdən keçirməyi lazım bilmişik.

Mütəfəkkirlərdən biri demişdir ki, insan həyatında tək bircə dəfə lüğətə baxsa, həmin lüğət ona verilən əməyi və pulu çıxarmış sayılır.

Türk dillərinin canı feildir. Bütün nitq hissələrinə aid sözləri özündə ehtiva edən bu lüğətdə feillər xüsusi çəkiyə malikdir. Feillərin leksik mənaları zəngin olduğu qədər də onların tematik qrupları rəngarəngdir. Tematik qruplar dedikdə "semantik cəhətdən ümumi xüsusiyyətlərə malik söz qrupları nəzərdə tutulur".

M.Kaşğari "Divan"ındakı feillər semantik cəhətdən bütün sahələri əhatə edir və dörd qrupa birləşir. 1-ci qrupa iş feilləri, 2-ci qrupa hərəkət feilləri, 3-cü qrupa hal-vəziyyət feilləri, 4-cü qrupa psixi fəaliyyət bildirən feillər daxil edilir. Tədqiq etdiyimiz abidədə iş feilləri özünün zəngin leksik-semantik xüsusiyyətləri ilə seçilir. Dilçilik ədəbiyyatında iş feilləri öz növbəsində iki böyük qrupa ayrılır.

İş feilləri insan həyatının müxtəlif sahələri, əmək fəaliyyəti ilə bağlıdır. İş feillərini daxili semantikasına görə aşağıdakı şəkildə təsnif etmək mümkündür.

Onlardan biri yaradıcı xarakterli iş feilləridir. Belə feillərə nümunə kimi ***biti* – "yazmaq"**, ***töşə* - "döşəmək"**, ***içüklə* - "astar salmaq"**, ***əsrilə* - "naxışlamaq"**, ***sapın* – "saplamaq"** və s. göstərə bilərik.

İş feillərinin 2-ci qrupu dağıdıcı xarakterli iş feilləridir. Belə feillərə nümunə kimi ***boğul- boğun*- "boğulmaq"**; ***kömün- kömül*- "basdırmaq"**, ***əvir-təvir* – "malın altını üstünə çevirmək"** və s. feilləri göstərmək olar.

"Divan"dakı ***bıç*- feili "kəsmək"**, **"biçmək"** anlamındadır. Zaman-zaman öz mənasını daraltmış **"bıçaq"** sözü **"kəsmək"** anlayışını özündə əks etdirir.

"Divan"da feillərin bir qismi icbar növdə verilmişdir: -dır$^4$, -t şəkilçisi qəbul etdikdə icbar feil olur**:** ***işlətdi* "iş gördürdü"**, ***bəzətti* "bəzətdirdi"** və s.

Feilin leksik-semantik təsnifatında hərəkət feillərinin mühüm yeri vardır. Hərəkət feilləri iki qrupa bölünür. Hərəkətin istiqamətini bildirən feillər: ***eviş*- "qaçmaq"; *vırat*- "uzaqlaşmaq", aşun – "keçmək"** və s. Hərəkətin üsulun bildirən feillər: ***səril*- "səndərləmək", *kavrul*- "qovrulmaq", *çıklış*- "sıxlaşmaq", *tundır*- "bağlamaq", *tərpəş* – "tərpənmək"** və s.

Feillərin leksik-semantik bölgüsündə hal-vəziyyət feillərinin böyük rolu var: ***tutuk*- "paslanmaq"**, ***kuru*- "qurumaq"**, ***onq*- "solmaq"**, ***kare*- "qocalmaq"** və s.

"Divan"dakı psixi fəaliyyət bildirən feilləri dörd qrupa ayıraraq araşdırmaya cəlb etmişik. 1. Nitq feilləri, 2. Duyğu feilləri, 3. Təfəkkür feilləri, 4. Emosional feillər. Belə qruplar kifayət qədər çox feili əhatə etdiyinə görə müxtəlif semantik qruplara bölünür. "Demək" anlayışı ilə bağlı sözlərin çoxu –la$^2$ şəkilçisi ilə işlənir. Məs.: ***anala*- "ana demək", *əkələ*- "böyük bacı demək", *çınla*- "təhqiq etmək, gerçəkliyi araşdırmaq",*çınlat*- "gerçəkləşdirmək, təsdiq etdirmək"** və s.

Dildə elə sözlər vardır ki, onlar hissi emosional vəziyyət ifadə edir: ***ağrıkan*- "ağrıdan şikayət etmək", *ağrış*- "sızlamaq"** və s.

Abidədə -lan$^2$ şəkilçisi artırmaqla (tayfa, xalq adına) yeni məzmunlu sözlər yaratmışlar. "Kiminsə qılığına girmək" anlamında: ***karluklan-, kıpçaqlan-, kəncəklən-*** və s. feilləri işlədilir. Abidədə **"öyrənmək"** feili ***öğrən,* "oxumaq"** feili ***okı*-** kimi verilmişdir.

Dilçilikdə sözlərin müxtəlif cür semantik təsnifatları aparılmışdır ki, bunların içərisində omonim, sinonim və antonimlik daha çox diqqət çəkir. Dil sistemində sinonimliyin mühüm rolu vardır. "Divan"da da elə sinonim cərgə ilə qarşılaşırıq ki, bu feillərin hər biri müasir dilimizdə işlənir. Məs.: ***süzülmək – tökülmək; öğrətti – biltürdü; tapıldı – bulundu; aşağıladı -ucuzladı.***

Abidənin dilində omonimlər də müəyyən yerə malikdir. Sadə quruluşlu omonimlərə misal olaraq: ***çapdı – a) üzdü, b) sürdü, c) boynunu vurdu; tapdı – a) tapındı, səcdə etdi, b) xidmət etdi, c) tapdı; kopdu – a) qopdu, b) durdu, c) uçdu.***

Düzəltmə quruluşlu omonimlərə misal: ***capturdı – a) üzdürdü, b) boynunu vurdurdu, c) palçıqla suvatdı.***

M.Kaşğarinin "Divan"ında feillər antonimik münasibətdə də müşahidə olunur: ***tik–sök; al-ver/ber; kit-kəl; in* "en" *-ağ* "qalxmaq"; *kir – çık.*** Düzəltmə quruluşlu antonimlərə misal: ***otlan* "odlan" *–* *odhın* "sönmək", *saçlan – tazlan.***

Məlumdur ki, M.Kaşğarinin "Divan"ında olan feillərin hamısını bu qruplarda bir fəsildə ümumiləşdirmək, leksik-semantik tədqiqini aparmaq mümkün deyil. Onların hamısı bir əsərə sığmayan feillərdir.

"Divan"dakı feillər quruluşca üç yerə bölünür: 1.Sadə, 2.Düzəltmə, 3.Mürəkkəb (tərkibi feillər).

Sadə feillər abidədə mühüm yer tutur. Türkoloji ədəbiyyatdan feillərin tarixən təkhecalı və ya ikihecalı olması barədə iki fikir özünü göstərir. M.Kaşğari "Divan"ında kifayət qədər birhecalı fellər vardır ki, onların çoxu müasir dövrümüzə qədər türk dillərində, Azərbaycan dilində yaşaya-yaşaya gəlmişdir: ***bıç-* biç, *süz-, sağ-, kəz-* gəz- "gəzmək", *kit-* "getmək", *kəl-* "gəlmək", *çık-* "çıxmaq", *kir-* "girmək"** və s. Müasir Azərbaycan dilinə qədər gələn sözlərdən: ***azdı, attı, aldı, eşdi, uçdı, ovdı*** və s.

"Divan"da olan iki, üç hecalı sözlərin özü də əslində birhecalı sözlərdən törənmişdir. Məs:. ***yubat-, oxşa-, yarat-, oğurla-, əsirgə-, kavuş-, soruş-*** və s.

Üç hərfli birhecalı feillər içərisində elələri də vardır ki, sonralar sözün əvvəlində işlənən **y** samiti düşmüşdür. Ona görə də ***yit-* it, *yut-* ud, *yıldırım-* ildırım, *yilan-* ilan** fonetik dəyişmələri dilimiz üçün təbii hesab edilir.

Abidədə sait+samit fonetik qəbilində iki feil də vardır ki, onların səslənmə fərqi bu gün dilimizdə *nq* səsinin olmaması ilə bağlıdır. Əsərdə ***ənq-* "çaşmaq"**, ***onq-* "solmaq"** kimi təqdim edilən bu sözlərdə əslində ***sağırnun*** samiti vardır ki, o da bir səsdir. Ona görə də verdiyimiz həmin nümunələr üç hərfli yox, iki hərfli sözlərdir. ***Usladı*** felinin kökü olan ***us*** sözü **"ağıl"** mənasında müstəqil şəkildə Azərbaycan yazılı abidələrinin dilində işlənmişdir, lakin verdiyimiz düzəltmə feilin özü fərqli məna ifadə etsə də, ***us*** kökü ilə bağlı olduğu aşkardır, yəni **"anladı"** mənasını bildirir. Göründüyü kimi, ***usladı*** sözü yoxdursa da, ***anlamaq*** sözü müasir dilimizdə sadə quruluşdadır. "Divan"dakı ***anqladı*** feili də müasir dilimizdə eyni mənada işlənir, sadəcə qədim ***nq*** (sağır nun) müasir variantında işlədilir. Bu söz tarixən düzəltmə olsa da, müasir dilimiz üçün sadə söz səviyyəsindədir.

Düzəltmə feillər yaranma yoluna görə üç qrupa bölünür: adlardan, feillərdən, təqlidi sözlərdən.

"Divan"da leksik şəkilçiləri, feil düzəldən şəkilçilərdən çoxluğu türk dillərini çox qədim tarixə malik olduğundan xəbər verir. "Divan"da adlardan feil düzəldən ən məhsuldar şəkilçi kimi –la$^2$ özünü göstərir. Onlardan bəzilərinin ifadə etdiyi məna müasir dilimizdə olduğu kimidir. Məsələn: ***otladı, araladı, ovladı, işlədi, anqladı.*** "Divan"da məhsuldar şəkilçilərdən biri –lan$^2$ şəkilçisidir. X.Niqmatov "Divan"da 294 felin –la$^2$ və 255 feilin –lan$^2$ şəkilçisindən yarandığını göstərir. Bu şəkilçi hər hansı əşyanın meydana çıxdığını, yeninin meydana gəlməsini göstərir. Məsələn: ***balıqlandı* "göl balıqlı oldu", *sögütləndi* "söyüdlər bitdi", *ətləndi* "kökəldi", *evləndi* "ev sahibi oldu"** və s.

Abidədə feil düzəldən şəkilçilərdən biri də -lat şəkilçisidir ki, bunların bəzisi icbar məzmunu bildirir. Məsələn: ***köklətdi* "bağlatdı, *sızlatdı* "ağlatdı"** və s.

-laş şəkilçisi adlardan feil yaradır, bu feillər də daha çox bir neçə subyektin gördüyü iş anlayışı ifadə olunur. Məsələn: ***sözləşdi, gözləşdi*** və s.

"Divan"da feil düzəldən şəkilçilərdən **-ar$^2$ *-kızar,* -ıq$^2$ *–kikikti* "kirləndi", -sa$^2$ -əvsədi, -it *–bititti* "yazdırdı", -at *–oklattı* "oxlatdı"** rast gəlirik.

"Divan"da feildən feil düzəldən şəkilçidən bəhs edirik ki, onlar söz yaradıcılığı ilə yanaşı, həm də növ və ya təsirlilik yaratma keyfiyyətinə malikdir. Bu şəkilçilər həm də təsirli və təsirsiz feil yaradan

şəkilçidir. "Divan"da feildən feil yaradan şəkilçilərin çoxu sonrakı türk dillərində və ya Azərbaycan dilində mövcuddur. Məsələn: -ıl$^4$ şəkilçisi. Bu şəkilçi təsirli feillərə artırılır və təsirsiz feil yaradır: **eş-eşil, aç-açıl, ört-örtül, sağ-sağıl, at-atıl və s.**

**-ın$^4$ şəkilçisi ilə:** ***tap-tapın, sürt-sürtün, kork-korkun*** və s.

**-ış$^4$** şəkilçisi ilə: ***tikişdi, barışdı, körüşdü,*** və s. feilləri düzəlir.

Qeyd edək ki, buraya –rus$^2$, -raş, -ruş, -rüş, -laş$^2$, lış şəkilçi variantları da var: ***keçrüşti*** **"bir-birinin günahından keçdilər"**, ***sıklışdı, saçlaşdı.***

-tür, -tur, -dur şəkilçisi ilə: ***tuttur-, bildür-, açtur-, çaltur-*** feilləri formalaşır.

"Divan"da düzəltmə feillər zəngin struktur xüsusiyyətlərə malikdir.

M.Kaşğari "Divan"da təqlidi sözlərə, səs təqlidi mənşəli sözlərə xüsusi diqqət yetirmişdir. Təqlidi sözlər səs təqlidi sözlər və obrazlı sözlər şəklində iki yerə ayrılır. Səs təqlidi sözlər canlı varlıqların, cansız əşyaların çıxardığı müxtəlif səslərin təqlid yolu ilə, obrazlı sözlər xarici aləm haqqında obrazlı təsəvvürün nəticəsində meydana gəlir. Bu feilləri tematik qruplara ayırmaq mümkündür: 1. İnsanın fəaliyyəti nəticəsində çıxan səsləri təqlid yolu ilə yaranmış feillər: ***çak-*** **"vurmaq", "çaxmaq";** ***təp-*** **"döymək", "vurmaq"** və s. 2. Başqa canlıların çıxardığı səsləri təqlid yolu ilə yaranan feillər: ***bələ-*** **"mələmək",** ***miyov*** **"miyoldamaq",** ***bozla-*****"böyürmək"** və s.

Düzəltmə quruluşlu səs təqlidi feillər bu şəkilçilər vasitəsi ilə yaranır**: -la,** ***-ahla-*** **"ah etmək";** ***çatla-*** **"ağlamaq",** ***sızla-*** **"sızlamaq"** və s.

"Divan"da səs təqlidi mənşəli tərkibi feillər (mürəkkəb fellər), əsasən, ***et-,bol-*** **və** ***kıl-*** köməkçi feilləri ilə yaranır: ***dang et-, kar-kur et-*** **"guruldamaq",** ***tok-tok et-*** **"taqqıldamaq",** ***yas bol*** **"ölmək",** ***yap-yup kıl*** **"hiylə etmək"** və s.

Abidədə verilmiş feillər qrammatik xüsusiyyətlərinə görə də zəngindir. Onlar təsirli və təsirsiz olmaqla iki qrupa bölünür: Bizə məlumdur ki, təsirlik hərəkətin obyektə təsiri ilə, növ isə obyekt və subyektin qarşılıqlı münasibəti ilə müəyyənləşir. "Divan"dakı feillərdə təsirlilik yaradan aşağıdakı şəkilçilərə nəzər salaq: -ır$^4$, -dır$^4$, -tur$^2$, -ğur, -gur, -kur, -uz$^2$, -duz$^2$ və s. Bu şəkilçilərlə formalaşan feillərə nümunə olaraq: **-ır –** ***taşur-*** **"daşdır";** ***kaçurdı*** **– "qaçırdı"; -dır$^4$, -tur$^4$ –** ***oldur;*** ***kaçtur-*** **"qaçırt";** ***taşdur-*** **"daşdır"** və s.

Qeyd edək ki, şəkilçilər vasitəsi ilə təsirsiz feillərdən təsirli feillər yarandığı kimi təsirli feillərdən də təsirsiz feillər yaranır: -in$^4$, -il$^4$, -iş$^4$, -iç$^4$, -sıç$^2$ şəkilçiləri ilə təsirli feillərdən təsirsiz feillər yaranır: ***toğrandı-; sancıl-; bölük-*** **"bölüm";** ***utsukt-*** **"uduldu"** və s.

Felin ən əsas qrammatik xüsusiyyətlərindən biri zaman bildirməsidir. Müasir dilimizdəki kimi "Divan"da da üç zamanın varlığı göstərilir: keçmiş, indiki və gələcək zaman. Müəllif göstərir ki, "feillərin təməli keçmiş zaman və əmr şəkli üstündə qurulur". Məlumdur ki, keçmiş zaman iki cürdür: şühudi və nəqli. Şühudi keçmiş zaman –dı$^4$//-tı$^4$ vasitəsilə, nəqli keçmiş zaman təsirsiz feillərə -mış$^4$ şəkilçisi artırmaqla düzəlir: ***barmış-*** **"gəlmiş"**. "Divan"da müasir türk dillərindəki kimi, indiki zaman – ır$^4$ şəkilçisi ilə formalaşır. Məsələn: ***cərgəsür-*** **"səf tutur"**.

Ə.Dəmirçizadə isə "Kitabi – Dədə Qorqud"un dilində indiki və gələcək zamanları ifadə edən şəkilçilərin hələ təşəkkül etmədiyini, hər iki zaman üçün eyni şəkilçinin işləndiyini qeyd edir.

M.Kaşğari isə qeyri-qəti gələcək zamanın Oğuzlarda iki şəkildə meydana çıxdığını söyləyir. Onun fikrincə qeyri-qəti gələcək zaman –ar$^2$, -ır$^2$ şəkilçiləri vasitəsilə formalaşır: ***mən gəlirən*** **"mən gəlirəm",** ***mən külərəm*** **"mən gülərəm"** və s.

Abidədə qəti gələcək zaman haqqında da məlumat vardır. Gələcək zaman -ğay, -kay, -gəy şəkilçilərilə ifadə olunur: ***mən barğay-*** **"mən gedəcəyəm",** ***Ol süt sağkay-*** **"O süd sağacaq", inkarda:** ***ol barmas-"o getməz"*** və s.

M.Kaşğari özü bu zaman formasını "əmri-hazır" adlandırır. Feillər zaman, şəxs və şəkil əlamətlərinə görə müxtəlif formalara malikdir: təsriflənən və təsriflənməyən. Nitqin qurulmasında, cümlənin formalaşmasında təsriflənən forma, yəni feil şəkilləri mühüm rol oynayır. Müasir dilimizdə olduğu kimi "Divan"da da feilin altı şəklinə rast gəlirik.

"Divan"da əmr şəkli xüsusilə diqqət önündədir. Bu forma üçün I şəxsin təkinə -ayın, cəminə -alın şəxs sonluqları aiddir: *Tün min bilə səvnəlim* "gecə-gündüz sevinək" Əmr şəklinin II şəxsinin təkində iki forma özünü göstərir. –gil, -kıl, -ğıl, -kil şəkilçisinin iştirakı ilə: ***üzüm yegil-*** və s. Onun **–qınan, -ginən**

forması da vardır. II şəxsin cəmi –nq, -nqla şəkilçiləri ilə düzəlir: ***barınq, barınqla*** **"gedin"**.III şəxsin təki –sun, -sün şəxs sonluğu ilə formalaşır: ***barsun, gəlsün*** və s.

Xəbər şəklinin xüsusi şəkilçisi yoxdur, zaman şəkilçilərindən sonra şəxs məzmunu yaradan formalarda bu halları müşahidə etdik. 1. Şühudi keçmiş zamanda hər üç şəxsin tək və cəmində -duk şəkilçisi işlədilir: ***Mən ya kurduk*** **"Mən yay qurdum"**, ***Ol anı urduk*** **"O onu vurdu"**. 2. I şəxsin cəmində -q, -k yerinə -mız şəkilçisi işlədilir. ***Kuşlar kibi uçtımız*** **"Quşlar kimi uçduq"**. 3. Müasir zamanda hər üç şəxsin tək və cəmində -an şəkilçisindən istifadə olunur. 4. İnkar forması hər üç şəxsin tək və cəmində -mas şəkilçisi ilə yaranır. ***Olar barmaslar***.

"Divan"da müəllif şərt şəklinin –sa$^2$ şəkilçisi ilə formalaşdığını göstərir: ***Kiçikdə katığlansa, ulğathu səvnür*** **"Kiçikkən çabalasa, böyüdükdə sevinər"**.

"Divan"da da feil şəkillərindən biri də arzu şəklidir. Müəllif yazır ki, bu şəkil arzu-istəklə yanaşı, həm də olmayan bir hərəkəti olmuş kimi göstərmək mənasını bildirir. Məs.: ***Mən səni görüksədim*** **"Mən səni görmək istədim"**, ***Ol manqa təlim gülümsündü*** **"O mənə çox gülər göründü"**.

Feilin lazım şəkli müasir dövrdə olduğu kimi "Divan"da –ası, -əsi şəkilçisi ilə formalaşır. ***Ol bizgə kələsi boldu*** **"O, bizə gələsi oldu"**. Feili sifətdə isə: ***Ol bisgə kəlğü boldu.***

Feil şəkillərindən biri də vacib şəklidir. M.Kaşğarlı "Divan"da vacib şəklindən bəhs açmamışdır. Düşünürük ki, R.Əskərin vacib şəkli adı altında təqdim etdiyi nümunələr feili sifətlərdir: ***Bu əvgə kirgü odh ol*** **"Bu evə girmə vaxtıdır"**.

R.Əskər yazır: "Divanü lüğat-it-türk"də gərək sözü ilə işlənən bir misalı məzmununa görə vacib şəklinə aid etmək olar**:** ***Tasığ usrımasa, öpmış gərək*** **"Daşı dişləyə bilməyən, gərək onu öpə, öpməlidir"**. Biz düşünürük ki, burada iki formadan biri verilməlidir: 1**. Gərək onu öpə**. 2. **Onu öpməlidir**. Gərək sözü arzu ədatıdır, arzu formasının yaranmasında iştirak edir. Ona görə də fikrimizdə daha dəqiq tərcümə məhz birincidir, həmin nümunə vacib yox, arzu şəkli kimi təqdim edilməlidir.

Feilin təsriflənməyən formaları. Təsriflənən formalar feilin şəkilləri, təsriflənməyən formalar isə məsdər, feili sifət və feili bağlamadır. Dilçilikdə məsdər müxtəlif adlarla adlandırılıb. Kaşqarlı əsərində onu "məsdər" adlandırır və qeyd edir ki, kökündə -ke və -ğe olan sözlərə -mak şəkilçisi artırılır. Məsələn: ***yay qurmaq, sağmaq, öğmək*** və s. Bəzən –sık$^2$ şəkilçisi də məsdər şəkilçisi kimi təqdim olunur. Qeyd edək ki, hər iki müəllifin nümunələri məsdər yox, feili sifət səciyyəlidir: ***gün toğsuk*** **"gün doğar"**, ***qılsığ ər*** **"qula bənzəyən adam"**.

"Divan"da geniş şəkildə təqdim olunan feil formalarından biri feili sifətdir. M.Kaşğarlı feili sifət şəkilçisi –an$^2$ Oğuzlarda, digər türk dillərində -ağan$^2$ olduğunu söyləyir. Məsələn: ***baran ol – barağan ol*** **"evə gedəndir"**. M.Kaşğarlı –ası, -əsi şəkilçisinin oğuz, qıpçaq, bəçənək, bulğar dillərində, -ğu, -ğü, -ku, -kü şəkilçisinin Çigil, Yağma, Toxsi, Arğu, Uyğur dillərində işləndiyini göstərir. "Divan"da feili sifət şəkilçilərindən –daçı$^2$ – ***gəldəçi ər*** **"Gələn adam"; -ındı –** ***kazındı torpak*** **"qazılmış torpaq"** və s.

Abidədə feili bağlama şəkilçisi **–ıp$^4$** ***kanı yazup turuktı*** **"qanı çox axıb, duruldu".**

Min il bundan əvvəl M.Kaşğari "Divanü lüğat-it-türk əsərində feilin növ kateqoriyasını verməklə kifayətlənməmiş, yeri gəldikcə onun yaranmasının yolu və vasitələri haqqında təsəvvür yaratmışdır.

Qədim türk dillərinin ilk araşdırıcısı və bu sahədə çox dəyərli əsər yaratmış Kaşgari beş növdən bəhs açır: məlum, məchul, qayıdış, qarşılıq-birgəlik, icbar. Deməli, növ kateqoriyası qədim və müasir türk dillərində ən az deformasiyaya uğrayan kateqoriyalardandır. M.Kaşğarlı bunlardan bəhs edərkən onları "öz müstəqil mənasında olan faillər" adlandırır. Məsələn: ***dirildi, azaldı, qurtuldu, yumrulandı*** və s. "Lüğət"də məchul növün –ıl$^2$, -ın$^2$ şəkilçiləri ilə formalaşdığı göstərilir: ***büküldü, tarıldı*** **"çəkildi"** və s.

Düzəltmə quruluşlu məchul fellər –sık, -suk, şəkilçisi artırmaqla yaranır: ***udsuktı*** **"uduldu"**, ***alsıktı*** **"alındı"** və s.

"Divan"da da qayıdış növün –ıl, -ın şəkilçiləri ilə meydana çıxdığı məlum olur. ***Büküldü*** **(budaq)**, ***büründü*** **(adam)** və s. –ıl şəkilçisi ilə formalaşan feil həm məchul, həm də qayıdış növ məzmununu ifadə edə bilər. Məsələn: ***örtüldü*** **(qapı) – məchul; (göy üzü buludlandı) – qayıdış**.

Ziyalı gənclərimiz bu zəngin qaynaq sayəsində M.Kaşğarinin böyüklüyünü, türkçülük və türkologiya qarşısında misilsiz xidmətlərini öyrənib, türk dili və ədəbiyyatı, türk tarixi və mədəniyyəti, etnoqrafiyası ilə bağlı geniş tədqiqat işləri aparıb, ondan istifadə edəcəklər.

## Reference

1. Divanü lüğat-it Turkish translation (translated by Besim Atalay) I volume, Ankara: 1939, 400 p.
2. Divanü lüğat-it Turkish translation (translated by Besim Atalay) II volume, Ankara: 1939, 512 p.
3. Divanü lüğat-it Turkish translation (translated by Besim Atalay) III volume, Ankara: 1941, 425 p.
4. Divanü lüğat-it Turkish translation (translated by Besim Atalay) IV volume, Ankara: 1943, 885 p.
5. Kipchak M. Journey to the world of words. Baku: Baku University Publishing House, 2002, 242 p.
6. Tekin Talat. Karahanlılar period. Turkish poetry. TD, issue 409. January 1986, p. 81-157.
7. Veshilova VF Verbs of introduction in Turkic languages // Research on comparative grammar of Turkic languages. Ch. II. - Moscow, 1962, p. 101-114.
8. Demirchizadeh A. M. Comparable method of linguist of XI century Mahmud Kashkarli Scientist works of SPUA, Baku 1966, № 1, p. 77-102.
9. Vinogradov VV Russian language. Moscow - "Higher School", 1972, 614 p.
10. Jafarov K.H. Lecsic-semantic system of Azerbaijan language. Baku “Science” publishment, 1984, 124 p.

Göndərilib: 28.11.2021 Qəbul edilib: 16.12.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/73/28-32

**Зейнаб Шахвалад гызы Рустамова**
Азербайджанская государственная
академия физического воспитания и спорта
старший преподаватель
zemarustamova@rambler.ru

# К ВОПРОСУ О ВРЕМЕННЫХ ФОРМАХ ГЛАГОЛА В НЕМЕЦКОМ ЯЗЫКЕ

**Alman dilində feilin zaman formaları məsələsinə dair**
**Xulasə**

Müasir alman dilinin altı indikativ zaman forması iki zaman perspekti (istiqamət) yaratmaq məqsədi daşıyır: indiki, keçmiş, gələcək kimi (mütləq zaman mənası); eyni vaxtda - hərəkətlərin müxtəlifliyi (nisbi zaman dəyəri). Formalar müxtəlif nitq şəraitində işləndikdə onların çoxmənalılığı özünü göstərir, formaların çoxsaylı kəsişməsi, mənalarının yaxınlaşması, sinonimliyi müşahidə olunur. Ona görə də zaman formaların mənasını ifadə edərkən həmin beş zaman sferasına görə izah etmək məqsədəuyğundur: eyni vaxtda, müxtəliflik, indiki, keçmiş, gələcək zaman ifadə edir.
***Açar sözlər**: Alman dili, indiki, keçmiş, gələcək, zaman formaları*

**The question of temporary forms of the verb in german language**
**Summary**

The six indicative tense forms of the modern German language are intended to create a tense perspective (orientation) in two dimensions: as present, past, future (absolute temporal meaning); as simultaneity - the diversity of actions (relative time value) ). When forms are used in different speech conditions, their polysemy is manifested, there is a multiple intersection of forms, convergence of their meanings, synonymy. Therefore, it is advisable to expound the meaning of tense forms according to those five tense spheres that they express: the present, the past, the future; simultaneity, diversity.
***Key words**: German, present, past, future, tense forms*

## Введение

В грамматике современного немецкого языка глагол считается основной частью речи и смысловым центром предложения. Как и в русском языке, глагол имеет категории лица, числа, времени, залога и наклонения, но не имеет категории вида. Категории лица и числа выражаются существительным или местоимением, к которому относится глагол. Остальные категории – собственные категории глагола. Формальными показателями глагола являются личные окончания и суффиксы основных форм.

При употреблении временных форм глагола в немецком языке в разных речевых условиях проявляется их многозначность, происходит многократное пересечение форм, сближение их значений, синонимия. Если сопоставить формы: Er kam – er kommt – er wird kommen, то они кажутся четко распределенными по трем временным сферам: настоящее – прошедшее – будущее. Но если наблюдать за ними в разных контекстах, то оказывается, что границы между ними стираются. Поэтому излагать значение временных форм целесообразно по тем пяти временным сферам, которые они выражают: настоящее, пошедшее, будущее; одновременность, разновременность. Первые три можно считать микрополями в Макрополе Времени.

Одновременность – разновременность нельзя считать отдельными микрополями, так как эти отношения совмещены с настоящим – прошедшим – будущим. Все остальные средства выражения временных отношений свободно «передвигаются» по всем микрополям или закреплены за каким-то одним полем (см. ниже).

Основной формой с этим значением является презенс. Настоящее время могут иногда выражать претерит и футурум. Чтобы понять особенности этих временных форм, надо выяснить, что такое настоящее время.

Границы настоящего времени могут совпадать с моментом речи Warum lächelst du?, а могут и растягиваться на отрезок времени любой величины.

В следующих четырех предложениях отрезок, покрываемый настоящим временем, становится все больше и больше:

Wir leben in Moskau

Wir leben i m 20. Jajrhundert.

In Afrika leben Krokodile.

Die Erde ist rund.

Это дало основание некоторым лингвистам объявить презенс вневременной или общей формой (1) .

Но дело не только в самом презенсе как в грамматической форме, а в понимании области настоящего времени. Стоит во всех вышеприведенных предложениях заменит презенс формой прошедшего или будущего времени, как исчезнет представление о настоящем времени:

Wir leben (werden leben) in Moskau.

Wir leben (werden leben) i m 20. Jajrhundert.

In Afrika leben (werden leben) Krokodile.

Die Erde ist (wird sein) rund.

И прошедшее и будущее время указывают на отсутствие данного действия (факта) с точки зрения говорящего, на его неактуальность (актуальность в смысле наличия фактов, неактуальность – отсутствие их).

Настоящее время - это область актуальных фактов, наличных фактов, действительных фактов. В зависимости от того, о каких фактах по отношению к каким субъектам идет речь, актуальность может распространяться на временной отрезок любой величины. В предложении Die Erde ist tund утверждается наличие признака субъекта, также как в предложении Diese Frau ist schlank, а различие временного диапазона связано с различием субъектов Erde и diese Frau.

Область настоящего времени - это область актуальных действий, а презенс - форма выражения актуальности.

Актуальность - неактуальность определяется с точки зрения участников речевого акта. В устной речи при непосредственном общении

собеседников в конкретной ситуации не представляет никакой трудности отличить настоящее время от ненастоящего. В данном случае употребителен только презенс как форма актуальности. В письменной речи (в художественной литературе) устная прямая речь имитируется, а условия ситуации описываются автором. В прямой речи сохраняются те же временные формы, что и в устной речи:

— In den Goldwäschereien ist ein feiner Ver dienst.

— War einmal, sagte Delamarche.

— Ist nch immer, sagte Robinson.

(F. Kafка - Amerika)

Значительно сложнее обстоит дело с авторской речью. Читая научный труд, мы воспринимаем как нечто совершенно естественное, что описываемые в нем факты изложены в презенсе (если речь не идет об исторических фактах, предыстории, сопоставлении современных данных с прошлым науки и т. п.). Презенс передает актуальность излагаемого содержания. Но большинство литературных художественных произведений написаны в форме претерита, реже воспринимается как прошедшее. Читая начало рассказа Стефана Хейма «Bablik»: «Bablik stand da, auf den Griff seines spatens gestützt, und blickte auf sein Haus» - или начало рассказа Вальтера Гориша «Mich dürstet»: «José war ein Pistolero. Also ein Subjekt, das bereit war, für eine gewisse Summe Pesetas auf Menschen zu schießen», читатель не противопоставляет мысленно прошедшее настоящему («теперь он уже больше не стоит!»), а представляет себе действия так, как будто они

развертываются синхронно, как актуальные события. Конечно, это фиктивное настоящее и фиктивная актуальность, также как фиктивны (вымышлены) и действующие лица, и место событий, и форма 1-го лица, от которой некоторые авторы ведут рассказ. Доказательством является то, что временное восприятие не меняется, если формой повествования избран презенс:

«Ich bin nicht Stiller! – Tag, seit meiner Einlieferrung in diese Gefängnis sage ich es, schwöre ich es und fordere Whisky») (M. Frisch - Stiller)

Фиктивность содержания, недопустимая в таких литературных жанрах, как научная проза, историческая хроника, в художественной литературе подчеркивается формой претерита, который здесь призван передать мнимую актуальность. Это впечатление поддерживается временными сопроводителями из Микрополя Настоящего времени heute, jetzt, augenblicklich: Der junge Schauspieler Raoul Rainer..., gelblich und mit melancholischen Augen, der augenblicklich nur 50 Mark Gage bezog... Zweig - Einberufung)

Следовательно, претерит как выразитель прошедшего в авторской речи художественного произведения носит условный характер. Претерит атемпорален (zeitindifferent), он представляет собой потенциальное настоящее, актуализированное до степени псевдонастоящего (Scheingegentwart), это «эпическое настоящее» (2).

Такое же псевдонастоящее выражает претерит во внутренней речи при передаче автором мыслей, чувств действующего лица:

Wo war Doktor Grabow? Die Konsulin erhib sich unauffalling und going. (Th. Mann - Buddenbrooks).

Футурум приобретает значение настоящего, если он вырвжвет предположение по поводу актуальности какого-то события, т.е. при присоединении семы «предположение». В контексте должны содержатся указания на презентное окружение, иначе футурум будет отнесен к области будущего:

Er zog eine ziemlich zerknitterte Depesche aus der Tasche... «Es wird von Maybaum sein,was Geschaftliches.» (F/C/ Weiskopf – Abschied vom Frieden)

«Vielleicht hat er sich versteckt», sagte der Wirt… “Diese Kühnheit wird er doch wohl nicht haben», sagte Frieda. (F.Kafka – Das Schloß)

Итак, если сравнить три формы, способные выразить настоящее время (актуальность события), то из них только презенс выражает чистую

и подлинную актуальность, в то время как претерит выражает мнимую актуальность в жанре художественной литературы, а футурум – предположение по поводу актуальности. Поэтому употребление претерита и фуиурума в Микрополе НВр ограничено, факультативно, презенс же независим от условий стиля, контекста или ситуации (если не происходит транспозиции)

Для выражения прошедшего времени служат формы: претерит, перфект, плюсквамперфект, презенс, футурум II.

Претерит – основная форма выражения неактуальности в данном микрополе. Это очевидно при противопоставлении презенса и претерита. Перфект более органичен в своем употреблении, чем претерит; отчасти потому, что он свойствен преимущественно прямой речи, в то время как претерит используется во всех видах речи; отчасти потому, что перфект специализировался на выражении предшествования по отношению к настоящему. Wir sind auch keine Ehgel und nie gewesen. (G. Harkenthal – Liebe ist mehr) Между претеритом и перфектом можно установит некоторые смысловые различия. Претерит выражает (кроме авторской речи художественного произведения) неактуальность, перфект же как бы перебрасывает мостик между неактуальностью и актуальностью, между прошедшим и настоящим. Он выражает действия, имевшие место в прошедшем, но не потерявшие связи с настоящим. Он соблюдает семой «контактность с настоящим». Эта связь проявляется разнообразно. Например, действие в перфекте может выражать причину какого-то действий или состояния в момент речи:

Draußen hämmer die Schachtsignale. Eline Elektromaschine brummt aufreizend. Die Schicht hat begonnen. (E. Strittmatter – Der Ochsenkutscher)

Перфект обозначает действие, результат которого актуален для настоящего времени:

Ich habe viel Geld gewonnen. (H. Mann - Eugenie) Großmuttet, ich hab mir ein Loch ins Knie gefallen. (H. Fallada – Geschichten aus der Murkelei) Aus uns ist geworden, was wir jetzt sind. (H. Mann - Eugénie)

Действие в перфекте служит прологом к действию а настоящем времени: Die alten Herren haben die erste Partie gespielt; nun stehen sie am Fenster. (Th. Storm – I m Sonnenschein)

Перфект оформляет выражение действия в прошлом, которое оценивается с позиции настоящего:

Ich bin all mein Lebtag nach ihm gelaufen und habe ihn nicht einmal zu sehen gekriegt. (H. Fallada – Geschichten aus der Murkelei)

Именно благодаря своей семе «контактность с настоящим» перфект избирается обычно как форма прошедшего времени в прямой речи, а претерит, не обладающий подобной семой, – в повествовании. Перфект в повествовании необычная форма, служащая для выделения значительного сообщения или личных замечаний автора по поводу описываемых событий: Einsam stand der Ritter noch lange bei der Statue des Laokoon, sein Antkitz war ebenso verzerrt und weiß, bewußtlos entblätterte er alle Rosen des Rosenbaums;er zerknokte sogar die jungen Knospen – der Baum hat nie wieder Blüten getragen – in der Ferne klagte eine wahnsinnige Nachtigall. (H. Heine - Ideen).

Различие между претеритом и перфектом яснее всего выступает при их противопоставлении в одном контексте: Er suchte ein Kathchen i m Leben und hat es nie gefunden. (L. Frank – Links, wo das Herz ist) Im Grunde ist er geblieben, was er war. (L.Börne)

Только перфект возможен во всех тех случаях, где речь идет о только что имевшем место действии, например в заключительном предложении оратора: Ich habe gesprochen, в ответ на вопрос «Не хотите ли вы есть?» Danke, ich habe gegessen, а также, когда результат действия непосредственно связан с настоящим, важен для него, например: Hast du dieses Buch gelesen? Haben Sie im Restaurant gegessen? Ist etwas gefallen? Hat es geklopft? Seid Ihr noch zur rechten Zeit gekomment? Du hast eine schlechte Arbeit geschrieben (3). Sieh da, es hat geregnet!

Плюсквамперфект в своем основном значении относится к области выражения разновременности двух прошедших действий.

Sie hatte erfahren, daß er geheiratet hatte. Aus irgendeinem Grund hielt sie das für ein Unrecht an sich. (B. Brecht - Dreigroschenroman)

Плюсквамперфект – зависимая от претерита форма: длительное повествование не может вестись в этой форме, плюсквамперфект выражает всегда действие, ориентированное на другое действие в претерите, предшествующее ему или, реже, следующее за ним. Поэтому плюсквамперфект занимает периферийное место в микрополе прошедшего времени.

Презенс участвует в микрополе прошедшего времени в своем второстепенном значении «исторического настоящего» (praesens histiricum): Unlägst sitze ich an der Tafel… (H. Heine – Idenn)

Для этого требуется транспозиция форм в речевые условия, типичные для доминанты данного микрополя – претерита. С помощью «переключателей» (лексических показателей прошедшего) и претеритального окружения презенс приобретает значение прошедшего времени. Противоречие между речевыми условиями и основным значением формы рождает особый коммуникативный эффект драматизации или экранизации событий, мнимой актуальности. Именно мнимая актуальность сближает претерит и презенс как формы повествования. Когда автор переходит от претерита к презенсу, то читатель не воспринимает это как скачок во времени; автор как бы меняет место съемки одного и того же окружения:

Es war auf einem Ball bei Baron Kreß. Eine junge Dame spielte eine Rolle dabei; und damals war er, der General, der beste Tänzer in Berlin. Damals wartete, gegen Morgen, ein Wagen vor der Treppe des Kreßschen Palais. Eline Dame springt die Treppe herunter. Sie hat den Pelz eilig um die Schultern geworfen. «Um Gottes willen», ruft sie, «er hat mich beobachtet, schnell.» Schon rollt der Wagen davon … (B. Kellermann – Der 9. November)

Претерит, усиленный словам damals, создает четкий фон прошедшего времени, на котором презенс может быть понять только как синоним претерита. Презенс в Микрополе Прошедшего времени занимает крайнее периферийное положение.

Футурум II выражает прошедшее время только при присоединении семы «предположение». В тексте должны быт указания на прошедшее время. Такое употребление типично для прямой речи: Wo bist du gestern hingekommen? – Wo werde ich hingiekommen sein? Nach Hause gegangen bin ich.

Для выражения будущего времени служат формы: футурум, презенс, претерит, перфект, футурум II.

## Заключение

Шесть временных форм индикатива современного немецкого языка предназначены для создания временной перспективы (ориентации) в двух планах: как настоящее, прошедшее, будущее (абсолютное временное значение); как одновременность – разновременность действий (относительное временное значение).

Оба плана слиты воедино. Нет временной формы, которая могла бы передать только одновременность – разновременность в отрыве от настоящего – прошедшего – будущего. Если бы существовал только один первый план, то он покрывался бы тремя формами: презенсом, претеритом, футурумом. Необходимость двойной временной характеристики вызвала появление еще трех форм: перфекта, плюсквамперфекта, футурума II.

## References

1. H. Glinz. Die innere Form des Deutschen. H. Weber. Das Tempussystem des Deutschen und des Französischen. Bern 1954.
2. Käte Hamburger. Die Logik der Dichtung. Stuttgart 1957. Robert Petesch. Epische Grundformen . “Germanisch – Romanische Monatsschrift”, 16 Jg. H. 9/10; 1928; Franz Stanzel. Die typischen Erzählsituationen im Roman. “Wiener Beiträgezur englischen Philologie”, B. LXIII, 1995.
3. H. Corrodi. Perfekt oder Imperfekt? “Sprachspiegel”, 1960/1, 16. Jg.
4. Zit. nach W.Günther. Probleme der Darstellung. «Die neuren Sprachen», Beiheft 13, 1928, S.141
5. Helbig G., Buscha J. Deutsche Grammatik. Ein Handbuch für den Ausländerunterricht. Leipzig, 1986.
6. Jung W. Grammatik der deutschen Sprache. Petersburg, 1996. 14.
7. Moskalskaja O. Grammatik der deutschen Gegenwartssprache. M.: Verlag Hochschule, 1983.
8. Urojewa R.M., Kusnezowa O.F. Phonetik und Grammatik der deutschen Sprache. M.: Verlag Hochschule, 1976.
9. Admoni W. Der deutsche Sprachbau. M.: Verlag Hochschule, 1986.
10. https://pspu.ru/upload/pages/8798/Nemeckaja_grammatika.pdf
11. https://www.de-online.ru/grammatika_nemeckogo_yasyka
12. https://u4ebagermania.ru/upload/iblock/618/618c50b3bcc4adc705080173b51ac9fe.pdf

Göndərilib: 29.11.2021 Qəbul edilib: 17.12.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/73/33-36

**Arzu Ağanəhmət qızı Mirzəyeva**
Azərbaycan Tibb Universiteti
müəllim
Mrs.arzu1960@gmail.com

# NİDALARLA İFADƏ OLUNAN İDİOMLARIN YARANMA YOLLARI

**Xülasə**

İdiomlar dilşünaslıqda sabit söz birləşmələri, frazeoloji birləşmələr, frazeologizmlər və s. adlar altında verilmişdir.

İdiom- İdioma yunan mənşəli sözdür. Mənası özünəməxsus xüsusiyyətlərə malik ifadə deməkdir. Həqiqi mənalı sözlərin qarşılığı olub onu məcazi məna ilə birləşdirən sabit söz birləşməsinə idiom deyilir. İdiomların ifadə etdiyi məfhum isə başqa söz birləşmələrinə nisbətən daha konkret olur.

İdiomlar sözün ekvivalenti, yəni məcazi məna ilə verilən sinonimi kimi dildə özünü göstərir.

İdiomlar milli xüsusiyyətlərə malik olduğuna görə hər bir xalqın dilindəki idiomları öyrənməklə həmin xalqın mədəniyyəti, tarixi və yaşayış tərzi ilə yaxından tanış olmaq mümkündür.

İdiomların əsas xüsusiyyətlərindən biri də onların obrazlı emosional ifadələr olmasıdır. Onlar hər hansı bir anlayışı ayrı-ayrı sözlərdən dəfələrlə təsirli və obrazlı əks etdirir. İdiomların özünəməxsus kateqoriyaları onu digər dil vahidlərindən fərqləndirir. İdiomlar dilin orijinal vasitəsi, varlığı və zənginliyidir.

İdiomların belə maraqlı xüsusiyyətləri dilçiliyin müxtəlif sahələri ilə məşğul olan alimləri – leksikoqrafları, üslubiyyatçıları, qrammatikləri, folklorşünasları da çox düşündürmüş və onları elmi təhhqiqat işlərinə cəlb etmişdir.

Azərbaycan dilində idiomlar ismi və feili olmaqla 2 qrupa bölünür.
***Açar sözlər:*** *sabit söz birləşmələri, idiomlar, frazeoloji vahidlər, obrazlı ifadələr, milli süsusiyyətlər*

**Summary**

Idioms in linguistics are given under the word combinations, phraseological combinations, phraseologisms, etc.

Idiom - An idiom is a word of Greek origin. It means an expression with its own characteristics. An idiom is a combination of words that have a real meaning and combine it with a figurative meaning. The concept expressed by idioms is more specific than other word combinations.

Idioms manifest themselves in language as the equivalent of a word, that is, a synonym given in a figurative sense.

Because idioms have national characteristics, it is possible to get acquainted with the culture, history and way of life of each people by studying the idioms in the language of each nation.

One of the main features of idioms is that they are figurative emotional expressions. They often express any concept more effectively and figuratively than individual words. Certain categories of idioms distinguish it from other language units. Idioms are the original means, existence and richness of language.

Such interesting features of idioms have made scientists of different fields of linguistics - lexicographers, stylists, grammarians, folklorists think a lot and involved them in scientific research. Idioms in the Azerbaijani language are divided into 2 groups, including nouns and verbs.
***Key words:*** *fixed word combinations, idioms, phraseological units, figurative expressions, national features*

Cümlədə qrammatik məna daşımayan nitq hissələrindən biri da nidalardır. Anlaşma, bir-birini başa düşmə həm əqli yolla – müstəqil sözlərlə, həm də hisslərlə - nida sözləri ilə mümkün olur. Nidalar məfhum bildirmir, başlıca olaraq, subyektin daxili aləmi ilə bağlı olur və müxtəlif hisslər – duyğular ifadə edir. İnsanın hiss-həyəcanını, duyğularını, hiddət və nifrətini, coşqunluğunu, nəşə və kədərini

bilavasitə, adlandırmadan təzahür etdirən sözlər – nidalar, həmin xüsusi səciyyəli sözlərin birləşdiyi söz kateqoriyası isə nida adlanır.

Türkalogiyada, xüsusilə Azərbaycan dilçiliyində nida ən az tədqiq olunmuş nitq hissəsidir. Qrammatikalarda nidaların mahiyyəti onların başqa leksik-semantik katiqoriyalardan (nitq hissələrindən) fərqlənən xüsusiyyətləri haqqında müxtəlif müəlliflər müəyyən fikirlər irəli sürmüşdülərsə də, bu fikirlərdə bir ardıcıllıq, dəqiqlik olmamışdır. (7.480-486)

İ.A.Batmanov nidanı ayrıca nitq hissəsi hesab etmirdi. Nidanın isimlər kimi hal və cəm şəkilçiləri qəbul etdiyini nəzərdə tutaraq müəllif bu sözləri, ümumiyyətlə, adlar qrupunda tədqiq etməyi lazım bilmişdir. (2.43 )

N.K.Dimitriyev başqırd dilində nidalardan bəhs edərkən onların həm isimlərdən, həm də feillərdən fərqli və qədim bir söz qrupu olduğunu göstərmişdir. (3.48-49)

A.N. Kononov da nidaları həm müstəqil, həm də köməkçi nitq hissələrindən fərqləndirib, ayrica tədqiq edilməsini zəruri sayırdı. (6.60)

Bəzi türk dillərində nida probleminə ayrıca elmi-tədqiqat əsərləri həsr edilmiş, dissertasiyalar yazılmışdır. S.Usmanov nidalardan bəhs edən namizədlik dissertasiyasında bu sözlərin bir sıra zəruri xüsusiyyətlərini araşdırmış, onların xüsusi nitq hissəsi olduğunu elmi əsaslarla sübuta yetirmişdir. (12)

Qazax dilindəki nidalar Ş.Y.Sarıbayevin namizədlik dissertasiyasında ətraflı şəkildə araşdırılmışdır. Əsərdə diqqəti cəlb edən cəhət, nidaların təqlidi sözlərdən semantik, struktur və sintaktik baxımdan artıb-çoxalmaq xüsusiyyətlərinə görə seçilən keyfiyyətləri çox ətraflı müəyyənləşdirilmişdir. (10)

Təqlidi sözlərlə nidaların fərqi daha bir sıra təqiqat əsərlərində işıqlandırılmışdır. (1)

Həm ümumi dilçilikdə, həm də türkoloji tədqiqatlarda nidalar mənşəyinə və mənasına əsasən təsnif edilir.

***A*** nidası təəccüb, heyrət, şadlıq, nifrət, qəzəb bildirir və bu şəkillərdə işlədilir: ***a, aa, a... a... a-a, a-a.., aaa, A! A! A!*** Dəlidən doğru xəbər. Bir bunun həyasına bax, a-a-a (9) Naçalnik çəpik çalıb qəh-qəh çəkib güldü və dedi: - A...a...a...a... Rəfiq, sən burada imişsən? (8)

***Ay*** nidası müxtəlif şəkillər alaraq (ay...., ay-ay... ay,ay,ay;...ayyy) *alqış, məmnunluq peşimançılıq, təəccüb, qəzəb, narazılıq* və s. duyğuları ifadə edir. ***Ay*** uşaq orda kim var? (9) ***Ayyyy...***, Nə qoyub nə axtarırsan (8)

***Ax***, ***ox, axx, ah*** şəkillərində işlənən nida s*evinc, arzu, razılıq, şikayət, qəzəb, qorxu* isteza kimi hissləri ifadə edir. ***Ax,*** necə kef çəkməli əyyam idi. (M.Ə.Sabir) ***Ah,*** Zərrintac xanım ona bir mənsəb yolu açsaydı. (9) ***Ah,*** kim oldun yolunda can fəda (11).

***Aha*** nidası sevinc,təəccüb, qəzəb və s. hissləri bildirir. ***Aha!..*** deməli sən o kişinin oğlusan. (9)

***Oy*** nidası e*tiraz, heyrət, qorxu* və s. hissləri ifadə edir. Aman, Aman, ***oy!*** Qaşı kaman ***oy!*** (Ü.Hacıbəyov)

***Ox*** nidası *yalvarış, qəzəb, hiddət, peşmançılıq* və s. hissləri bildirir: ***Ox, ox!..*** Öldürdü onu namərd oğlunun gülləsi (8)

***Uf*** nidası *təəccüb, etiraz, qəzəb, peşmançılıq* və s. hissləri bildirir: ***Uff...*** onun sözləri nə qədər şirindir. (9)

***Vay-vay, ey vay*** nidaları *qorxu, əzab, təəssüf, nifrət* və s. hissləri bildirir: ***Vay- vay!*** Deyəsən bəşər deyil bu. (11) ***Vay- vay!*** Nə yaman müşkülə düşdü işim allah (11) Başqa söz tapmıram cəlladsınız siz ***vay*** öldüm, ***vay*** öldüm kömək ediniz.(S.Rüstəm)

***Ah, ax, vah, ey vah*** nidaları *qəzəb, nifrət, razılıq istehza, həsrət* mənalarında işlənir: Etdim nə yaman əsrə təsadüf aman ***ey vah!*** Molla qovula, yəni müəllim gələ, ***vah-vah!*** Molla ona həsrət çəkə küçədə ***ah!.. ah!..(***11) ***Ax,*** nə yaxşı kişidir qonşumuz Ağcanın əri (11). ***Ax!..*** necə kef çəkməli əyyam idi, onda ki, övladi-vətən xam idi. (11)

***Ə*** nidası *sevinc, qorxu, xahiş* ifadəsi üçün işlənir *(ə, əə, əəə).* Ə, yaxşı rədd olun gedin cəhənnəminizə.

***Oho, paho, pəh-pəh, bəh-bəh, bah-bah, ha-ha-ha, qah-qah-qah, oxqay, can, aycan-aycan***, nidaları *sevinc, şadlıq, istehza, təəccüb, tərif və s. mənaları verir.* Soltan bəyin qızı bir gədəyə aşiq olubdur ***pəh-pəh-pəh.*** (Ü.Hacıbəyov) Port-Artur, hüriyyəti-Mançuriya, ***qah-qah!..Bah! bah!..*** yenə ***bah-bah...*** yenə ***bah-bah!*** yenə ***bah-bah!..(***11) ***Qah-qah!..*** Qaribə gülməlisən Xaniman xərab!.. (11)

Düşdü bütün qəzetlər hörmətdən, ***aycan! aycan!*** Xəlqin canı qurtardı töhmətdən, ***aycan! aycan!*** (11) ***Pah,*** nə çoxdur bütün İranda ləqəb. (11) ***Bəh-bəh!..*** həp aşınayi – qürbət! (11)

***Haray, ay haray, aman, ay aman*** nidaları *imdat, çağırış, yalvarış, nifrət, qəzəb* və s. kimi məna ifadə edir: ***Ay haray***, bir neçə şair, neçə şair kimilər, İstəyir döndərələr Gəncəyə Şirvanımızı (11). Qorxdum ***ay aman,*** yarıldı bağrım (11).

***Əfsus,*** hayif nidaları *təəssüf* mənası ifadə edir: ***Əfsüs,*** "Həyat" isə məmat oldu, qapandı. (11) *Səd heyf,* gözəl hökmi-şəriət tələf oldu. (11)

Belə mürakkəb nidalardan biri də, ***lənət sənə kor şeytan*** ifadəsidir. ***Vay dədə vay, vay dədəm vay, vay nənəm vay*** nidaları *təəccüb, qorxu* hisslərini bildirir: ***vay dədəm vay***, bu mənim öz əvvəlki arvadımdır.

***Ey dadi-bidad*** nidası *peşmançılıq, təəccüb, qorxu* hisslərini əks etdirir. ***Ey dadi-bidad*** Ərdəbil.(8)

Dilimizdə bir qrup alınma nidalar bir-birinə sinonim kimi işlənir. Bunlardan ***afərin (farscadan), əhsən, maşallah, mərhaba, bərəkallah (ərəbcədən)*** nidalarını göstərmək olar. Bərəkallah usta cavan olsan da pərgarsan (9)

Əslində dini məzmuna malik olan bir sıra nidalar köhnə adətlər ilə əlaqədardır. Bura ***maşallah, şükür, amin, lənət, lənətulla, tövbə, əttövbə, əşhədibillah, əstəğfurullah, allahuəkbər, lailəhaillələllah kimi dini səciyyəli nidalar daxildir: Lənət sənə kor şeytan, ha!...*** (9);

***Nidalar işlənmə yerinə görə sərbəstdir:*** yəni cümlənin əvvəlində, ortasında və sonunda işlənir: Ey dövlətimin zavalı oğlum! Ey başı ağır bəlalı oğlum! Ey məktəbi dərsin aşinası! Ey rişteyi-elm mübtəlası! (11) Hə de görüm, nə oldu bəs, ay balam, iddiaların. (11) Əhli-aləm arayıb axtarır, ey can, səni.(11)

Dilimizdə bəzi sözlər vardır ki, onlar müstəqil mənalı söz kimi işlənməklə bərabər, nida mənalı qovuşma idiomların yaranmasında iştirak edir.

İdiom-İdioma yunan mənşəli sözdür. Mənası özünəməxsus xüsusiyyətlərə malik ifadə deməkdir. Həqiqi mənalı sözlərin qarşılığı olub onu məcazi məna ilə birləşdirən sabit söz birləşməsinə idiom deyilir. İdiomların ifadə etdiyi məfhum isə başqa söz birləşmələrinə nisbətən daha konkret olur.

İdiomlar sözün ekvivalenti, yəni məcazi məna ilə verilən sinonimi kimi dildə özünü göstərir.

İdiomlar milli xüsusiyyətlərə malik olduğuna görə hər bir xalqın dilindəki idiomları öyrənməklə həmin xalqın mədəniyyəti, tarixi və yaşayış tərzi ilə yaxından tanış olmaq mümkündür.

İdiomların əsas xüsusiyyətlərindən biri də onların obrazlı emosional ifadələr olmasıdır. Onlar hər hansı bir anlayışı ayrı-ayrı sözlərdən dəfələrlə təsirli və obrazlı əks etdirir. İdiomların özünəməxsus kateqoriyaları onu digər dil vahidlərindən fərqləndirir. İdiomlar dilin orijinal vasitəsi, varlığı və zənginliyidir.

İdiomlar yaranmasına görə üç yerə ayrılır: qovuşma idiomlar, birləşmə idiomlar və uyuşma idiomlar.

Qovuşma idiomların bir qismi bir qayda olaraq, nida sözləri əsasında yaranır. Nida mənalı qovuşma idiomların aşağıdakı struktur tipləri vardır:

1.Şəxs əvəzliklərinə ***ölmək*** feilinin əlavəsi ilə: $P_z + V$

***Mən ölüm*** – ***Mən ölüm*** *ay Əhməd Fitrət, o yediyin balığın adını ata-anamız "balıx" qoyub, sən də elə "balıx" de, "balıq" demə. (8.171)*

***Sən öləsən*** – ***Sən öləsən***, *qoymanam. Gərək gedek bizə. Bu saat samovarım dəmdədi. Sən öləsən, gərək gedəsən. (8.179)*

***Siz öləsiniz*** – ***Siz öləsiniz***, *balığın bir ətrinə tamaşa eləyin, ey.(8.176)*

2. *Sən* ikinci şəxs əvəzliyinə ***allah, peyğəmbər, İmam Hüseyn, Həzrət Abbas*** və s. mövhumi adların əlavəsi ilə: $P_z + N$

***Sən allah*** – ***Sən allah***, de görüm nə yuxu görmüsən?(8) ***Sən allah,*** *Kəblə Qasım, nağıl elə görək qonaqlıq necə kecdi, qonaqlara nə berdilər, ağam nə qayırdı, kimnən danışdı, nə danışdı?* (8.141)

*Sən İmam Hüseyn – A kişi, sən İmam Hüseyn, özünü dəsgaha qoyma* (8.103)

*Sən Həzrət Abbas – A kişi, sən Həzrət Abbas, boş-boş danışma! Elə söz danışırsan ki, pişmiş toyuğun gülməyi gəlir.* (8.103)

3. Mənsubiyyət şəkilçisi olan ismə ***üçün*** qoşmasının əlavəsi ilə: $N_m + P_p$

*Başın üçün – o qızıldan qiymətli **başın üçün**, düşüb dalımca pusquya, gölgə kimi izimdən üzülmür.*(9.127) ***Başın üçün,*** *mənim anamın bir az huşu başında deyil, elə rəhmətlik atam Kərbəlayı Heydər öləndən anam gün olmazdı ki, ağlamasın.* (8.69) *Biri olsun bu torpaq şöbəsi Cabbarzadə, başınız üçün, məni lap xirtdəyimə yığıb.* (8.117)

***Canın üçün*** – yox, əmioğlu, mən sizə getmənəm, əvvəl sən bizə gərək gələsən, sonra mən sizə gedəm, yoxsa ***canın üçün*** getmənəm. (8.179)

4.Adlıq halında ismə üçüncü şəxs əmr formasının təkini bildirən köməkçi feilin əlavəsi ilə $N_n$+V

***And olsun*** – *Camaat, bu saat mənim evimdə seyid qızı əyləşib.* ***And olsun*** *gedib üzümü sürtdüyüm qəriblər şahına, bu saat onun əynində libası yoxdur.* (8.101) *And olsun allahın birliyinə, sən birdə mənim işlərimə qarışsan, mənim sözümün qabağında söz danışsan, ta özünü ölmüş bil.* ***And olsun*** *allaha, qabırğalarını sındıraram.* (8.51) ***And olsun*** *hər ikimizi yaradana, vətəndə mənim qardaşımın bir oğlu var, olar 13-14 yaşında. Əvvəl-axır yeddi-sakkiz il məscidə gedib. Amma di gəl xəttinə, allah bağışlasın.* (8.100) *Xan,* ***and olsun*** *sənin başına, bizi katda çox incidir, əslinə baxsan bizim bu katdamız özgə tayfadandı, odu ki, bizi görməyə gözü yoxdur.* (8.91) *A kişi, adına* ***and olsun****, eşşəyi mənə Məmmədhəsən əmi özü verib.* (8.33)

*Narahat gecəm üçün*
*Həsrət gündüzüm üçün*
*Sinəmdəki bu gizli*
*Alovum, gözüm üçün*
*Yenə sənə borcluyam.*
***And olsun*** *yerə, göyə,*
*Alqış bu sənsizliyə!* (3-247)

Nidaların işlənməsi şəxsin əhval-ruhiyyəsindən, mədəni səviyyəsindən, yaşından, cinsindən, sağlamlığ dərəcəsindən, obyektə münasibətindən, mühitdən, səs tellərinin vəziyyətindən və.s. asılı olaraq gülüşün növləri də müxtəlif şəkildə təzahür edir. Ağlarkən, gülərkən çıxarılan səslər müxtəlif fərdi keyfiyyətlərlə əlaqədar çox müxtəlif ola bilər.

## References


1. Adilov M.İ. Imitative words Azerbaijan SSR, S.A News 1961. №6
2. R.Kungurov Illustrative words in the modern Uzbek language (n. D. A.), Tashkent 1962
3. Batmanov I.A. Parts of speeches in the Kyrgyz language, Frunze, 1936 p. 43
4. Dimitriyev NK Grammar of the Bashkir language, M.-L., 1948 Pages 48-49
5. Gulgun M. "Roads that do not tire me". Writer, Baku, 1978.
6. Huseynzade M. Modern Azerbaijani language. Maarif Publishing House, Baku - 1983
7. Kononov A.N Grammar of modern Turkish literary language, M.-L. 1956, p. 60
8. Modern Azerbaijani language, Volume 2, Science Publishing House, Baku, 1980
9. Mammadguluzadeh J. and Hagverdiyev A. Selected Works. Youth, World Children's Literature Library. Baku - 1983
10. Rahimov J. Selected works, 5th volume. Azerneshr, Baku - 1974.
11. Sarıbayev Ş. Y. Mezhdometiya in the Kazakh language. Alma-Ata, 1959 11. Sabir M.A. Hophopname Baku. 2004
12. Usmanov S. Mezhdometiya in the modern uzbek language (n. D. A) Tashkent, 1952


**Rəyçi: dos. X.Məhərrəmova**

Göndərilib: 03.12.2021 Qəbul edilib: 21.12.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/73/37-42

**Sevinc Şöhrəddin qızı Qarayeva**
Azərbaycan Dövlət Aqrar Universiteti
assistent
qarayevasevinc705@gmail.com

# AQRAR SAHƏNİN İNVESTİSİYA CƏLBEDİCİLİYİNİN YÜKSƏLDİLMƏSİ İSTİQAMƏTLƏRİ

**Xülasə**

Qloballaşma prosesinin intensiv xarakter aldığı müasir dövrdə milli iqtisadiyyatların təhlükəsizliyinin təmin edilməsi istiqamətində labüd tədbirlərin həyata keçirilməsi zərurətə çevrilmişdir. Beynəlxalq münasibətlər sisteminin mövcud səviyyəsi hər bir ölkədə istehsal sahələrinin rəqabətədavamlığının yüksəldilməsini, iqtisadiyyatın çoxşaxəliliyinin təmin olunmasını şərtləndirir. Bu aspektdə yüksək istehsal potensialına malik olan və eyni zamanda strateji əhəmiyyət daşıyan aqrar sektorun yüksəlişi Azərbaycan iqtisadiyyatının hazırki inkişaf mərhələsində xüsusi əhəmiyyət kəsb edir. Məlumdur ki, aqrar sahənin spesifik xüsusiyyətləri onun digər sahələrlə müqayisədə investisiya cəlbediciliyini aşağı olmasına zəmin yaradır. Hazırda aqrar sahənin investisiyalaşdırılmasında əsas meyar məhsul istehsalının artırılması, istehsal edilən məhsulun keyfiyyətinin yüksəldilməsi və məhsul vahidinin maya dəyərinin aşağı salınması hesab edilir. Odur ki, aqrar sahədə investisiya fəaliyyətinin məqsədli şəkildə həyata keçirilməsi yüksək iqtisadi göstəricilərə nail olunmasına istiqamətlənir. Aqrar sahənin investisiya cəlbediciliyinin yüksəldilməsi zamanı, əsas məqsəd regionların resurs potensialından optimal səviyyədə istifadə olunması, ÜDM istehsalında iqtisadiyyatın bütün sahələri üzrə inkişafın təmin olunması və ən əsası kəndin sosial vəziyyətinin yaxşılaşdırılması məqsədini güdür. Hesab edirik ki, Azərbaycanda kənd təsərrüfatının inkişafı məqsədilə dövlət tərəfindən həyata keçirilən iqtisadi siyasət, yaxın gələcəkdə aqrar sahənin istehsal göstəricilərinin əhəmiyyətli dərəcədə yüksəlişinə təkan verəcəkdir.

***Açar sözlər:*** *kənd təsərrüfatı, investisiya, maliyyə siyasəti, iqtisadi konyuktura, qloballaşma*

## Directions for Increasing the Investment Attractiveness of The Agricultural Sector

**Summary**

In the current period of intensive globalization, it is necessary to take necessary measures to ensure the security of national economies. The current level of the system of international relations contributes to increasing the competitiveness of industries in each country, ensuring the diversification of the economy. In this regard, the growth of the agricultural sector, which has a high production potential and is also of strategic importance, is of particular importance at the current stage of development of the Azerbaijani economy. It is known that the specific features of the agricultural sector make it less attractive for investment than other sectors. At present, the main criteria for investing in the agricultural sector are to increase production, improve the quality of products and reduce the unit cost of production. Therefore, the targeted implementation of investment activities in the agricultural sector is aimed at achieving high economic performance. In order to increase the investment attractiveness of the agricultural sector, the main goal is to make optimal use of the resource potential of the regions, to ensure the development of GDP in all sectors of the economy and, most importantly, to improve the social situation in rural areas. We believe that the economic policy pursued by the state for the development of agriculture in Azerbaijan will give impetus to a significant increase in agricultural production in the near future.

***Key words:*** *agriculture, investment, financial policy, economic situation, globalization*

## Giriş

Son illər Azərbaycan iqtisadiyyatının geniş potensiala sahib sahələrindən biri kimi aqrar sahənin imkanlarınının qiymətləndirilməsi baxımından aparılan araşdırmalar göstərir ki, kənd təsərrüfatından məqsədli investisiya proqramlarının işlənib hazırlanması zamanı əsas məqsədlərdən biri də sahənin

investisiya cəlbediciliyinin yüksəldilməsidir. Aqrar sahənin investisiya cəlbediciliyinin yüksəldilməsi zamanı, əsas məqsəd regionların resurs potensialından optimal səviyyədə istifadə olunması, ÜDM istehsalında iqtisadiyyatın bütün sahələri üzrə inkişafın təmin olunması və ən əsası kəndin sosial vəziyyətinin yaxşılaşdırılması məqsədini güdür. Qeyd etmək lazımdır ki, kənddə sosial və istehsal infrastrukturlarının müasir tələblərə cavab verməsi, xarici investorların cəlb edilməsi üçün başlıca vasitələrdən biri hesab edilir. Təbii ki, istehsal və sosial infrastrukturun beynəlxalq standartlara uyğunlaşdırılması, hər bir xarici investorun bu və ya digər regionunda, uzunmüddətli zaman kəsiyində məskunlaşmasına əlverişli şərait yaradır. Bundan əlavə, mövcud kommunikasiya sisteminin, eləcə də kəndin mədəni-məişət səviyyəsinin yüksəldilməsi də bu baxımdan xüsusi önəm kəsb edən məsələlərdən biridir.

Bilindiyi kimi aqrar sahənin spesifik xüsusiyyətəri ilə əlaqədar investorlar, iqtisadiyyatın digər sahələri ilə müqayisədə bu sahəyə bir qədər həssas yanaşmasına səbəb olur (1.səh15). Bu baxımdan aqrar sahənin investisiyalaşdırılmasında maraqlı olan hər bir investor ilk öncə sahənin imkanlarının qiymətləndirmək baxımından əsas meyar kimi məhsul istehsalının artırılmasını, istehsal edilən məhsulun keyfiyyətinin yüksəldilməsini və məhsul vahidinin maya dəyərinin aşağı salınmasını əsas hədəf kimi müəyyənləşdirir. Odur ki,aqrar sahə ezrə investisiya fəaliyyəti məqsədli həyata keçirilməklə yüksək iqtisadi göstəricilərə nail olunması ilə səciyyələnir. İnvestisiya fəaliyyətinin səmərəliliyi istehsalat təsərrüfat proseslərində əlavə xalis gəlirin əldə edilməsi və yatırılan vəsaitin ödəmə müddətinin məhdudlaşdırılması ilə bilavasitə bağlıdır. Təbiidir ki, vəsait qoyuluşunun ödəmə müddəti nə qədər az olarsa, investisi proseslərinin həyata keçirilməsinə stimullar da bir o qədər yüksələr (2 səh.21). İnvestisiya fəaliyyətinin nəticəsi olaraq vəsaitlərin qaytarılması nə qədər uzunmüddətli xarakter daşıyarsa, bu prosesə sərf olunan xərclərin dəyərsizləşməsi baş verə bilər. Bundan əlavə investisiya fəaliyyətinin nəticələri qısa müddət ərzində əlavə xalis gəlirə çevrildiyi halda, əldə olunan vəsaitin yeni istehsal sahələrinə də yatırılması bütövlükdə təsərrüfat prosesinin rentabelliyini yüksəldir.

Aparılan araşdırmalar göstərir ki, kənd təsərrüfatında sahibkarlıq və investisiya fəaliyyətində risklərin yüksək dərəcədə olması, sahə üzrə investisiya cəlbediciliyinə təsir edən ən mühüm faktorlardan hesab olunur (2.səh.97). Cəmiyyət üçün xüsussi əhəmiyyət daşıyan bu sahənin istehsal potensialını yüksəltmək,mövcud olan risq səviyyəsini minimuma endirməyi tələb edir. Bu məsələ ölkə iqtisadiyyatının hazırki inkişaf mərhələsində kifayət qədər aktual bir problem kimi qalmaqdadır. A.B.Krutikin fikrincə, risklərin idarə edilməsi vacibdir, bu son nəticədə risklərin səviyyəsinin aşağı salınmasına və onların proqnozlaşdırılmasına imkan verə bilər (3səh.144).

B.İ.Qryadovun fikrincə risk menecmenti, məhz risklərin qiymətləndirilməsi prosesini özündə əks etdirir və risklərin edilməsi risklərlə əlaqədar yarana bilən xərclərin minimuma endirilməsində mühüm rol oynayır (4 səh.75). E.A.Utkinin fikrincə, biznes fəaliyyətinin həyata keçirilməsi prosesində yaranan maliyyə münasibətlərinin və risklərinin idarə edilməsi risk-menecment sisteminin formalaşmasını şərtləndirir. Kənd təsərrüfatında risklərin idarə edilməsi investisiya cəlb ediciliyinin yüksəldilməsində əhəmiyyətli rol oynayır (5səh.21). Bu zaman aşağıdakı elementlərin nəzərə alınması vacibdir ki, bunlara da risklərin təhlili, risklərin qiymətləndirilməsi və risklərin aşağı salınması ilə bağlı istifadə edilən metodların seçilməsini şamil etmək olar. Qeyd etmək lazımdır ki, risklərin idarə edilməsi prosesində ən mühüm məqamlardan biri risklərin təsirinin aşağı salınması ilə bağlı metodların müəyyənləşdirilməsidir. Bəzi müəlliflər hesab edirlər ki, müəssisələrin fəaliyyəti zamanı risklərin aşağı salınmasında istifadə edilən əsas metodlar iştirakçılar arasında risklərin bölüşdürülməsini təmin etmək, eləcə də görünməyən xərclərin kompensasiya olunması ilə bağlı vəsaitlərin müəyyənləşdirilməsi və ən nəhayət biznes planının işlənməsi və sığorta sisteminin formalaşdırılmasından ibarətdir.

İnkişaf etmiş ölkələrin təcrübəsi göstərir ki, kənd təsərrüfatına investisiya qoyuluşlarını stimullaşdırmaq məqsədilə məqsədli güzəştlərdən istifadə edilir (6səh.47). Bu baxımdan kənd təsərrüfatına investisiyaların cəlb edilməsi baxımından həmin güzəşt sistemindən istifadə edilməsi vacibdir. Belə ki, xarici investorların kənd təsərrüfatına vəsait qoyması və eləcə də emal sənayesinin inkişaf etdirilməsi, kənd təsərrüfatında ayrı-ayrı sahələrin inkişaf etdirilməsinə vəsait qoyulması üçün müxtəlif vergi güzəştlərindən istifadə edilməsi və eləcə də onların stimullaşdırılması və təşviqi vacib şərtlərdən biridir. Təbii ki, bütün bunlar son nəticədə nəinki kənd təsərrüfatında məhsul istehsalının

artırılmasına əlverişli şərait yaratmaqla yanaşı, eyni zamanda həmin məhsulların daxili və xarici bazara çıxış imkanlarının genişləndirilməsinə də əlverişli şərait yarada bilər. Bu baxımdan kənd təsərrüfatına yararlı torpaq sahəsi, o cümlədən əkin sahələrinin müəyyən müddət ərzində xarici investorlara icarəyə verilməsi və eləcə də onların ödədikləri vergilərin azaldılması və digər vasitələrlə təşviq edilməsinə xüsusi diqqət yetirilməlidir.

Qeyd etmək lazımdır ki, kənd təsərrüfatı istehsalının investisiyalaşdırılması, ərzaq bazarında sabitliyin təmin edilməsinə yönəldiyindən, dövlət tərəfindən həyata keçirilən tədbirlər, nəticə etibarilə investisiya proseslərinə gərəkli dəstək verməkdən ibarət olur (7 səh 124). Bu baxımdan dövlət tərəfindən həyata keçirilən tədbirlər qanunvericilik aktları, sərəncamlar vasitəsilə reallaşdırılır.Kənd təsərrüfatında investisiya və sahibkarlıq fəaliyyətinin subsidiyalaşdırılması mexanizmindən dövlət tənzimlənməsinə kifayət qədər geniş şəkildə istifadə edilir (8səh.21). Aqrar istehsalda sahibkarlıq fəaliyyətinin və investisiya proseslərinin aktivləşdirilməsinə yönəldilmiş subsidiyalaşdırma mexanizmi, bir qayda olaraq bitkiçilik, heyvandarlıq məhsullarının subsidiyalaşdırılmasına və ucuz kreditlərin cəlb edilməsinə yönəldilir. Bu baxımdan heyvandarlıq komplekslərinin və quşçuluq fabriklərinin tikintisinə və yenidən qurulmasına istiqamətlənmiş investisiya kreditlərinin həyata keçirilməsi ərzaq bazarında əmtəə kütləsinin artırılmasına əhəmiyyətli təsir göstərir. Dövlət büdcəsindən ayrılan subsidiyalardan, bir qayda olaraq damazlıq heyvandarlıq sisteminin dəstəklənməsinə, eləcə də elit toxumçuluq sisteminin formalaşdırılmasına, yüksək dağlıq rayonlarda kənd təsərrüfatı istehsalının davamlılığın təmin edilməsinə istifadə edilməsi məqsədə uyğun istifadə edilir.

Son illər dünyada baş vermiş covid-19 pandemiyası ilə əlaqədar qlobal iqtisadi böhranının doğurduğu neqativ təzahürlərin kənd təsərrüfatına təsirini neytrallaşdırmaq məqsədilə, bu sahənin investisiyalaşdırılması xüsusilə mühüm əhəmiyyətə malikdir. Bu baxımdan böhranlı vəziyyətlərdə investisiyaların kreditlər hesabına maliyyələşdirilməsi mexanizminin təkmilləşdirilməsi mühüm əhəmiyyətə malikdir. Bu baxımdan inkişaf etmiş ölkələrdə kənd təsərrüfatının inkişafının dövlət sərəncamında olan investisiya bankları yaradılır və bu banklar vasitəsilə kənd təsərrüfatının investisiya kreditləşdirilməsi prosesi həyata keçirilir. Adı çəkilən qurumların funksiyaları kənd təsərrüfatının prioritet sahələrinin maliyyələşdirilməsini təmin etməkdən ibarət olur. Ümumiyyətlə götürdükdə, strateji və iqtisadi cəhətdən prioritetə malik olan kənd təsərrüfatı sahələrinin bir-başa maliyyələşdirilməsi ərzaq təminatı sistemində müsbət tendensiyaların əldə edilməsinə əlverişli şərait yaradır. Bu zaman başlıca məqsəd xaricdən daxil olan məhsulların yerlərdə istehsalını təşkil etmək və idxalı əvəz etmə siyasətini reallaşdırmaqdan ibarətdir. Aparılan araşdırmalar göstərir ki, investisiyaların kreditləşdirilməsi ilə bağlı prioritet istiqamətlərin seçilməsi, xüsusilə vacib amillərdən biridir. Bundan əlavə kreditləşmə istiqamətlərinin seçilməsinə nəzarətin gücləndirilməsi, eləcə də vəsaitlərin təmərküzləşdirilməsi də bu sahədə müsbət dəyişikliklərin əldə edilməsində önəmli rol oynayır.

İnvestisiyalaşma prosesi ilə bağlı kredit qurumlarının yaradılmasına dövlətin təminatı, nəticə etibarilə bu qurumlara xarici investisiyaların cəlb edilməsinə də mühüm təsir göstərir. Bu onunla bağlıdır ki, bu sahəyə dövlət təminatının verilməsi nəticəsində xarici investisiyaların maraqlarının təmin edilməsi həyat keçirilir ki, bu da onların kənd təsərrüfatına investisiya qoyması üçün əsas amillərdən birinə çevrilir (9 səh 67).

Cədvəl 1

Kənd təsərrüfatına yönəldilən investisiyaların dinamikası

| | Əsas kapitala yönəldilmiş investisiyalar, | | Kənd təsərrüfatı, ovçuluq və meşə təsərrüfatı | |
|---|---|---|---|---|
| İllər | Mln manat | Xüsusi çəkisi, faizlə | mln manat | Xüsusi çəkisi, faizlə |
| 2005 | 5769.8 | 100 | 40.6 | 0.7 |
| 2009 | 7724.9 | 100 | 266,6 | 3,5 |
| 2010 | 9905.7 | 100 | 431 | 4,4 |

| | | | | |
|---|---|---|---|---|
| 2011 | 12799,1 | 100 | 437,3 | 3,4 |
| 2012 | 15407,3 | 100 | 648,8 | 4,2 |
| 2013 | 17850,8 | 100 | 574,3 | 3,3 |
| 2014 | 17618,6 | 100 | 363,9 | 2,07 |
| 2015 | 15957,0 | 100 | 355,4 | 2,2 |
| 2016 | 16772,8 | 100 | 325,1 | 2,1 |
| 2017 | 17430,3 | 100 | 617,8 | 3,5 |
| 2018 | 17244,9 | 100 | 764,4 | 4,4 |
| 2019 | 18539,5 | 100 | 769,5 | 4,1 |
| 2020 | 9065,3 | 100 | 520,6 | 3,0 |

Mənbə: www.stat.gov.az

Araşırmalardan məlum olur ki, hazırda respublikamızda aqrar sektora yönəldilən investisiyaların iqtisadiyyata yönləndirilən ümumi investisyaların içərisində xüsusi çəkisi çox kiçikdir. Belə ki, 2020-cı ildə kənd təsərrüfatına 520,6 mln manatlıq investisiya qoyulmuşdur ki, bu da milli iqtisadiyyatda əsas kapitala yatırılmış məcmu investisiyanın 3,0 %-ni təşkil etmişdir. 2010-2020-cu illər ərzində kənd təsərrüfatına investsiya qoyuluşlarının məcmu investisiya qoyuluşlarında xüsusi çəkisi maksimum 4.4%-i ötməmişdir. (10).




**Şəkil 1. 2020-ci ildə iqtisadiyyatın sahələri üzrə əsas kapitala yönəldilmiş investisiya (faizlə)**

Mənbə: www.stat.gov.az

Hazırda ölkə iqtisadiyyatına yatırılan investisiyaların strukturunu təhlil edərkən məlum olur ki, neft amilinin də təsiri ilə ökədə ən çox investisiya sənaye sektoruna yönəldilir. Son illər respublikamızda həyata keçirilən infrastruktur layihələrinin təsiri və eyni zamanda şəhər quruculuğuna moderləşmə tədbirlərinin həyata keçirilməsi nəticəsində tikinti sektoruna yönəldilən investiyaların xüsusi çəkisini xeyli yüksəltmişdir. Aqrar sahəyə yönləndirilən investisiyaların miqdarı son 5 ildə əhəmiyyətli dərəcədə yüksəlsə də qlobal səviyyədə müşahidə olunan covid-19 pandemiyasının təsiri 2020-ci ildə bu sahəyə yönləndirilən investisiyaların miqarında kəskin azalmaya səbəb olmuşdur. Belə ki, 2019-cu ildə kənd təsərrüfatına 769,5 milyon manat investiya yatırılmışdısa 2020-ci ildə bu göstərici 248,9 milyon manat azalaraq 520,6 manata bərabər olmuşdur ki, bu da əvvəlki illə müqayisədə 32,4% azalma deməkdir.

Aqrar sahədə investisiya proseslərinə dövlət müdaxiləsinin ən mühüm istiqamətlərindən biri, risklərin sığortalanmasına yönəldilmiş tədbirlərin həyata keçirilməsidir (11səh 24). Ümumiyyətlə, kənd təsərrüfatının davamlı inkişafına nail olunması aqrar sahədə investisiya cəlbediciliyinin yüksəldilməsini tələb edir ki, bunun üçün isə başlıca amil risklərin səviyyəsinin aşağı salınmasıdır. Dünya praktikasında dövlət bir qayda olaraq, sığorta ödəmələri ilə bağlı kənd təsərrüfatı əmtəə istehsalçılarının çəkdikləri

xərclərin 50%-ni öz üzərinə götürür. Kənd təsərrüfatı məhsullarının becərilməsi ilə əlaqədar risklər sistemindən sığortalanması sisteminin kommersiya dəyəri, bir qayda olaraq fermerlər üçün əlverişsiz xarakter daşıyır və bu kifayət qədər yüksək səviyyədədir. Təbii ki, risklər sisteminin kənd təsərrüfatı əmtəə istehsalçıları üçün kifayət qədər əlverişsiz olduğunu nəzərə alaraq, dövlət bu sahədə məsuliyyəti öz üzərinə götürməlidir. dünya praktikasında təbii fəlakətlərin doğurduğu nəticələri aradan qaldırmaq üçün xüsusi məqsədli fondlar yaradılır. Bu fondlardan isə, kifayət qədər təbii fəlakətlərdən zərər çəkmiş fermerlərə kompensasiyalar ödənilir. Bu tip kompensasiya ödəmələrinin spesifik xüsusiyyətləri onunla əlaqədardır ki, ödənilən kompensasiyalar bir qayda olaraq, xüsusi məqsədli fondun həcmindən asılı olur və həmin fondların xərclənmə qaydaları, istər dövlət idarəetmə sisteminin şəffaflığı ilə də sıx əlaqədardır. Bu baxımdan sığorta sisteminin təkmilləşdirilməsi və bu sahədə şəffaflığın təmin edilməsi də, investisiya proseslərinin tənzimlənməsində əhəmiyyətli amillərdən biri sayılır/

Aparılan araşdırmalar göstərir ki, kənd təsərrüfatından məqsədli investisiya proqramlarının işlənib hazırlanması zamanı əsas məqsədlərdən biri də sahənin investisiya cəlbediciliyinin yüksəldilməsidir. Sahənin investisiya cəlbediciliyinin yüksəldilməsi zamanı, əsas diqqət kəndin sosial inkişafının yüksəldilməsinə yönəldilir. Qeyd etmək lazımdır ki, kənddə sosial və istehsal infrastrukturlarının müasir tələblərə cavab verməsi, xarici investorların cəlb edilməsi üçün başlıca vasitələrdən biri hesab edilir. Təbii ki, istehsal və sosial infrastrukturun beynəlxalq standartlara uyğunlaşdırılması, hər bir xarici investorun bu və ya digər regionunda, uzunmüddətli zaman kəsiyində məskunlaşmasına əlverişli şərait yaradır. Bundan əlavə, mövcud kommunikasiya sisteminin, eləcə də kəndin mədəni-məişət səviyyəsinin yüksəldilməsi də bu baxımdan xüsusi önəm kəsb edən məsələlərdən biridir.

## Nəticə

Azərbaycan respublikasında iqtisadi diversifikasiyanın bu qədər aktual olduğu müasir dövrdə yüksək istehsal potensialına malik aqrar sektorun davamlı inkişafını təmin etmək üçün sahəyə yönləndirilən investisiyaların miqdarının artırılması məsələsi hazırda dövlətimizin həyata keçirdiyi iqtisadi siyasətin prioritetini təşkil edir. Hesab edirik ki, bu istiqamətdə reallaşdırılan bir sıra mühüm tədbirlərlə yanaşı aşağıdakı məsələlərin həllidə əhəmiyytli ola bilər:

-aqrar sahədə rəqabətə davamlı istehsal infrastrukturunun formalaşdırılması baxımından sahəyə yönləndirilən investisiyalarının səmərəliliyinin artırılması ;

-aqrar əmtəə istehsalçılarına tətbiq olunan dövlət yardımlarının içərisində ixracyönümlü istehsala təşviq edən mexanizmlərin formalaşdırılması ;

-kənd təsərrüfatı istehsalçıları ilə səmərəli inteqrasiya əlaqələri formalaşdıran müəssisələrin maliyyə təminatının yaxşılaşdırılması;

-investisiya və innovasiya siyasətinin aqrar sahədə tətbiq imkanlarının genişləndirilməsi ;

-bank sektorunun kredit portfelində biznes kreditlərinin içərisində aqrar sektorun xüsusi çəkisinin artırılması və kredit şərtlərininm bu sahədə fəaliyyət göstərərn sahibkarların maraqlarına uyğunlaşdırılması;

-kənd təsərrüfatı və iqtisadiyyatın digər sahələri arasında qiymət disparitetinin aradan qaldırılması;

-kənd təsərrüfatında sosial yardım institutlarının formalaşdırılması və onun səmərəliliyinin yüksəldilməsi.

- xarici iqtisadi fəaliyyətin həyata keçirilməsi zamanı yerli əmtəə istehsalçılarının maraqlarının müdafiə edilməsi;

- aqrar-sənaye istehsal sferasında elmi fəaliyyətin həyata keçirilməsinə investisiyaların yönəldilməsi;

- kəndin sosial infrastrukturunun inkişaf etdirilməsi və s.

## References

1. "Economics of agriculture" Kovalenko N.Ya. Moscow – 2004
2. Huseynov M.C. Problems of sustainable development of the agrarian sector. Baku, Nurlar, 2006, 304 pages
3. Gryadov VI Entrepreneurship in the APC, Moscow, 1997, p 351

4. Utkin E.A. Risk management. Moscow, 1998, 288 pages
5. Salahov S.V. Problems of state regulation of the agrarian sector. Baku, Nurlar, 2004, 504 pages
6. Problems of sustainable development of the agrarian sector. Collective monograph, Azerbaijan Scientific-Research Institute of Agricultural Economics and Organization, Baku, 2012, 438 pages
7. Abbasov A.F. Food security. Baku, 2007, p. 602, 465 pages
8. Qasimli V.A. Investment in the agricultural sector: directions of modernization. News of ANAS (economy series) 2, Baku 2012.
9. I.H. Ibrahimov. Issues of regulation of entrepreneurial activity, Baku, 2010, 240 pages.
10. www.stat.gov.az
11. Karimova T.I Investment potential of the economy: mechanisms of formation and use. Baku, 2008, p. 25, 225 pages

**Rəyçi: dos. E.A.Salahov**

Göndərilib: 02.12.2021 Qəbul edilib: 21.12.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/73/43-47

**Nərmin Nizami qızı Cəfərova**
Bakı Slavyan Universiteti
dissertant
ndjafarova@gmail.com

# AKP İQTİDARI DÖVRÜNDƏ TÜRKİYƏ-İRAQ SİYASİ MÜNASİBƏTLƏRİNƏ DAİR

**Xülasə**

Məqalədə Türkiyənin xarici siyasətində İraq faktoru və onun spesifik, geosiyasi aspektləri araşdırılır. Burada AKP hökumətinin regional siyasətində İraq faktoru dəyərləndirilir, regional qeyri-sabitlik kontekstində Türkiyə-İraq münasibətlərinin inkişafının əsas problemləri və tenden-siyaları təhlil edilir, İraqdakı kürd problemi araşdırılır.

Burada müəllif tərəfindən İraqın coğrafi, geosiyasi və geoiqtisadi (enerji) mövqeyi və qonşuluq əlaqələri, həmçinin terror təşkilatı PKK-nın İraqdan Türkiyəyə yönəlik hərəkətlərinin qarşısını almaq zərurəti, Kərkük problemi, türkmənlərlə bağlı haqsızlıqlar, federal strukturun ortaya çıxması ilə İraq Kürdüstanı bölgə hökumətinin faktiki muxtariyyətdən rəsmi hüquqi statusa keçməsi, İraqın vahid strukturunun qorunması zərurəti və digər məsələlərin Türkiyənin xarici siyasətində İraq amilinə xüsusi özünəməxsusluq verdiyi fakt və arqumentlər əsasında göstərilir.

Beləliklə, məqalədə Türkiyənin xarici siyasətində İraq faktoru kompleks şəklində siyasi aspektdən təhlil edilir.

***Açar sözlər:*** *AKP,Türkiyə, İraq, siyasi münasibətlər, Türkiyə - İraq Əməkdaşlıq Şurası*

## On Turkey-Iraqi political relations under AKP power

**Summary**

The article examines the Iraqi factor in Turkey's foreign policy and its specific, geopolitical aspects. It assesses the Iraqi factor in the regional policy of the AKP government, analyzes the main problems and trends in the development of Turkish-Iraqi relations in the context of regional instability, studies the Kurdish issue in Iraq.

The author discusses Iraq's geographical, geopolitical and geoeconomic (energy) position and neighborly relations, as well as the need to prevent the terrorist organization PKK from moving from Iraq to Turkey, the Kirkuk problem, injustices against the Turkmen, The transition to legal status, the need to preserve the unified structure of Iraq and other issues are based on the facts and arguments that give a special character to the Iraqi factor in Turkey's foreign policy.

Thus, the article analyzes the Iraqi factor in Turkey's foreign policy from a complex political point of view.

***Key words:*** *AKP, Turkey, Irak, political relations, Turkey-Iraq Cooperation Council*

Son illərdə Yaxın Şərqdə kəskinləşən siyasi, hərbi və etno-konfessional proseslər İraqda 2003-cü il müharibəsindəndən sonra qeyri-sabit qalan daxili siyasi vəziyyətdə və həmçinin günü-gündən mürəkkəbləşən Türkiyə və İraq arasındakı əlaqələrdə əks olunur. 2003-cü ildə xarici hərbi müdaxilə nəticəsində prezident S. Hüseynin devrilməsindən sonra qəbilə və dini qruplara bölünmüş İraqdakı qeyri-sabitlik xroniki bir xəstəlik xarakteri aldı. 2011-ci ildə ərəb dünyasında başlayan inqilablar dalğası və həmin ilin dekabr ayında rəsmən sona çatan ABŞ işğalı ordusunun İraqdan çıxarılması bu ölkədə daxili siyasi ziddiyyətlərin daha da kəskinləşməsinə gətirib çıxardı (14,s.390.

İraqla bağlı həmçinin Türkiyənin də siyasətində bir dəyişiklik nəzərə çarpmağa başlayır: Ankara ilə Bağdad arasındakı münasibətlərin pisləşməsi fonunda Kürd Muxtar Bölgəsi (KMB) ilə əlaqələrin inkişaf etdirilməsi daha çox əhəmiyyət kəsb edir. Bu hadisə Türkiyənin Yaxın Şərqdə xarici siyasətinin yeni bir elementi olub, regional konteksti əks etdirir və öz növbəsində İraqın xarici amillərdən asılı olan daxili vəziyyətin inkişafına təsir göstərir. Ankaranın Bağdad və Erbil ilə siyasi əlaqələrinin metamorfozu 2003-cü ildə Türkiyənin İraqa müdaxilədə iştirak etməkdən imtina etməsi və İraq cəmiyyətinin bütün etnik və dini qrupları ilə əlaqələrin inkişaf etdirilməsi siyasəti Ankaraya bir neçə il

ərzində Bağdadın yeni rəhbərliyi ilə siyasi münasibətlərin nizamlanmasında əhəmiyyətli uğurlar qazanmasına imkan verdi.

2008-ci ildə Baş nazir R.T.Ərdoğan 18 il müddətində ilk dəfə olaraq Bağdadı ziyarət etdi. Türkiyə və İraq hökumətlərarası əməkdaşlığın yeni formatı - Yüksək Səviyyəli Strateji Əməkdaşlıq Şurasının yaradılması haqqında bəyannamə imzaladılar. Burada Hökumət başçıları və ya xarici işlər nazirlərinin başçılığı altında iki ölkənin nazirlər kabinetlərinin birgə iclaslarının keçirilməsi nəzərdə tutulurdu (8). Türkiyə-İraq Əməkdaşlıq Şurası Türkiyənin Rusiya da daxil olmaqla bir neçə dövlətlə, yaradılan oxşar strukturlardan biri olmuşdur. 2009-cu ildə Türkiyə prezidenti A.Gül İraqı ziyarət etmişdi. Həmin ildə Türkiyə İraqın Bəsrə və Mosul şəhərlərində konsulluq açdı. Sonrakı illərdə, iki ölkə liderləri arasında siyasi əlaqələr və nazirlik səviyyəsində səfərlərin mübadiləsi müntəzəm olub, Türkiyə-İraq əlaqələrinin inkişafına dinamik xarakter vermişdir.

Lakin, 2011-ci ilin sonu - 2012-ci ilin əvvəllərində Ankara ilə Bağdad arasındakı münasibətlər kəskinləşdi və hələ də davam edən uzun müddətli böhran formasını aldı. Türkiyə rəhbərliyinin İrakın Baş naziri Nuri əl-Maliki (şiələrin nümayəndəsi) ilə əlaqələrində gərginlik hələ 2010-cu ildə yaranmışdı. Belə ki, parlament seçkiləri zamanı Türkiyə onun əsas rəqibini - Əl-İraqiya hərəkatının lideri (dünyəvi sünni və şiələri birləşdirən) A.Əllyəvini dəstəkləyirdi. Lakin seçkilərdən sonrakı yarım il ərzində İraqın rəqib siyasi qüvvələrinin hökumətin formalaşması barədə razılığa gələ bilməməsi İraqdakı vəziyyətin normallaşmasında maraqlı olan Ankaranı, N.Malikiyə dəstək verməyə məcbur etdi. 2010-cu ilin oktyabrında İraqın Baş naziri siyasi böhranı aradan qaldırmaq üçün region ölkələrinə yardım axtarışı turu zamanı Ankaraya səfər etdi. Nəticədə Türkiyə İraqda daxili vəziyyətin tənzimlənməsində fəal iştirak etdi.

2010-cu ilin noyabrında Türkiyənin xarici işlər naziri A. Davudoğlu İraqa səfər edərək, bir sıra İraq siyasətçiləri ilə görüşdü və onları kompromisə çağırdı. “Ərəb baharı” hadisələri və İraqdan ABŞ ordusunun çıxarılması İraq və Türkiyənin rəhbərliyi arasında siyasi münaqişə üçün katalizatorlar rolunu oynadı. Ankara və Bağdad Suriyadakı iğtişaşlar ilə əlaqədar fərqli mövqelər tutdular: Türkiyə, hökumətə müxalif qüvvələrə, Dəməşqdəki rejimin dəyişdirilməsinə, Suriyada və digər Ərəb ölkələrində “İslam demokratiyasının Türk modeli” nin yayılmasına dəstək verdi. İraq şiələri Baş nazir N.Malikinin rəhbərlik altında, Suriyada sünni əksəriyyətin hakimiyyətə gəlməsi perspektivi və qonşu ölkəyə xarici hərbi müdaxilə ehtimalı ilə əlaqədar narahatlığını dilə gətirdi. 2011-ci ilin payızında Türkiyə Suriya rejiminə iqtisadi təzyiq siyasətinə uyğun olaraq bu ölkə ilə ticarət və iqtisadi əlaqələri kəsməyə başladı (2).

İraq Ərəb Dövlətləri Liqasının Suriyaya iqtisadi sanksiyalar tətbiq edilməsinə dair qərarına səs verməkdən boyun qaçırdı və iqtisadi mühasirənin məqbul bir təsir vasitəsi hesab etmədiyini söylədi (12). Daha sonra Bağdad dəfələrlə Suriya münaqişəsinə xarici müdaxilənin qəbuledilməz olduğunu bəyan etmişdir (13), Türkiyə isə Suriyanın şimalında bufer zona yaratma ehtimalı olduğunu düşünərək, Dəməşqə qarşı hərbi təzyiqə yol açan Birləşmiş Ştatların hazırladığı BMT TŞ-nin qətnamə layihəsini dəstəklədiyini bildirdi (11). Suriya ilə bağlı əks mövqelər və beynəlxalq aləmdə müxtəlif istiqamətli addımlar Türkiyə və İraq rəhbərliyi arasında qarşılıqlı narazılıq və etimadsızlıqkasasının aşıb-daşmasına səbəb oldu. İraqdan ABŞ qoşunlarının çıxarılması münaqişə edən qrupların fəllaşması ilə, İraq cəmiyyətində etno-konfessional ziddiyyətlərin alovlanması ilə müşayiət edildi.

2011-ci ilin sonu -2012-ci ilin əvvəllərində İraqda şiə məzhəbli Baş nazir N. Maliki ilə onun sünni rəqibləri arasında qarşıdurmaya əsaslanan daxili siyasi böhran baş verdi. Ən parlaq epizod 2012-ci ilin iyun ayında Suriya hava məkanında türk kəşfiyyat təyyarəsi vurulandan qısa bir müddət sonra N. Maliki bildirdi ki, Türkiyə təyyarələri İraq hava məkanını müntəzəm olaraq pozur və belə pozuntular davam edərsə, İraq onları vuracaqdır (9).

Söhbət Ankaranın uzun illər ərzində Şimali İraqda Kürdüstan İşçi Partiyasının (PKK) döyüşçülərinə qarşı mübarizə çərçivəsində Türkiyə aviasiyasının etdiyi kəşfiyyat uçuşları haqqında idi. Əvvəllər Türkiyənin hərəkətlərinə ölkənin şimalında - Kürd bölgələrində vəziyyətə nəzarət etmək qabiliyyəti məhdud olan Bağdad narazılığını biruzə vermirdi. Öz növbəsində, Türkiyənin Baş naziri R.T.Ərdoğan N.Malikini qeyri-demokratik idarə etməsinə və İraqı vətəndaş müharibəsində cəlb etməsinə görə günahlandırdı (4).

Ankara ilə Bağdad arasındakı əlaqələrin pisləşməsi fonunda baş nazir N.Maliki, Suriya istiqamətində Türkiyə siyasətinin ictimaiyyət tərəfindən qınanmasını təşkil etdi. Xüsusilə, o, 2012-ci ilin

oktyabr ayında Rusiyaya səfərindən sonra Türkiyənin bütün bölgəni qeyri-sabitliyə aparan səhv bir siyasət yürütdüyünü və Suriya xalqının əvəzinə Suriyanın daxili məsələlərini həll etməyə çalışdığını ifadə etdi (11). İki baş nazirin arasındakı şifahi duellər emosional intensivliyi ilə 2013-ci ildə də davam etdi. Beləliklə, fevral 2013-cü ildə N.Malikinin Livan televiziyasına verdiyi müsahibəsində Türkiyənin bölgə ölkələrinin daxili işlərinə müdaxilə etməsi ittihamlarına Türkiyə Xarici İşlər Nazirliyi tərəfindən cavab verildi. Bəyanatda deyilirdi ki, "İraq Baş nazirinin bəyanatları başqalarına özünə xas olan mənfi xüsusiyyətlərini və davranışlarını digərlərinin adına çıxmaq cəhdindən başqa bir şey deyildir" (5).

Türkiyə və 2005-ci ilin İraq Konstitusiyasında təsbit edilən İraq Kürd Muxtar Vilayəti arasında əlaqələr daha da aktivləşir. İraq Kürdüstanının yeni rəsmi statusu, Ankara qarşısında İraq kürdlərinin liderləri ilə rəsmi təmas problemini həll etmək zərurəti qarşısında qoydu. Qeyd etmək lazımdır ki, bu, Türkiyə üçün asan bir iş deyildi. Bir tərəfdən, İraq kürdləri ilə rəsmi təmaslar Türkiyədəki kürdlər arasında separatizmin artmasına səbəb ola bilər və türk cəmiyyətində psixoloji qarışıqlıq yarada bilərdi. Türkiyə dövlətinin PKK yaraqlıları ilə uzun illərdə silahlı mübarizəsi belə bir təsəvvür yaratmışdı ki, kürdlərin hər hansı bir regionunun muxtariyyətləşdirilməsi prosesi Türkiyənin milli təhlükəsizliyi üçün təhlükə yarada bilər. Digər tərəfdən, mövcud reallığı inkar etmək mümkün deyildi. Ankara bir neçə il İraq Kürdüstanını və onun rəhbərliyinin yeni statusunu rəsmən tanımaqdan qaçsa da, Türkiyə ilə Şimali İraq regionu arasında iqtisadi əlaqələr dinamik inkişaf edirdi.Xüsusilə, 2009-cu ilin payızında Türkiyə xarici işlər naziri Əhməd Davudoğlu, İraq səfəri zamanı Kürd muxtariyyətinin paytaxtı Erbildə şəhərində KMV-nin rəhbərliyi ilə görüşdükdən sonra vəziyyət dəyişməyə başlamışdır.

Ankara ilə Erbil arasındakı siyasi əlaqələrin qurulmasında növbəti addım 2010-cu ilin iyun ayında İraq Kürdüstanının prezidenti M.Barzani tərəfindən Türkiyəyə ilk səfər olmuşdur. M.Barzani ilə danışıqlardan sonra A.Davudoğlu Türk Hava Yolları ilə Erbil istiqamətində birbaşa uçuşların başlanacağını elan etmişdir. Kürdlər Yaxın Şərqin dörd ölkəsi: Türkiyə, İraq, İran və Suriya ərazisində kompakt şəkildə yaşayır. A.Davudoğlu qeyd etdi ki, "Türkiyə ilə Şimali İraq arasında tam iqtisadi inteqrasiya Türkiyə və İraqın daha da yaxınlaşması üçün bir körpü olacaqdır" (6).

2011-ci ildə Türkiyənin Baş naziri R.T.Ərdoğan ilk dəfə İraqda səfərdə olarkən Ərbilə baş çəkdi və Kürdüstan muxtariyyatını paytaxtında Türkiyə konsulluğunun açılış mərasimində iştirak etdi. O vaxtdan bəri Ankara ilə Erbil arasındakı rəsmi siyasi əlaqələr müntəzəm hala gəldi və müzakirə olunan məsələlər yalnız ikitərəfli əməkdaşlığı deyil, aktual regional problemləri əhatə edirdi. Belə ki, 2013-cü ilin iyul ayının sonunda Ankaranı ziyarət edən Kürdüstan Muxtar bölgəsinin Baş naziri N.Bərzaninin tərəf müqabili ilə görüşündə Suriyadakı vəziyyət, Suriya kürdlərinin vəziyyəti, Misirdəki son hadisələr və Ankara və Ərbil arasındakı siyasi əlaqələrin qurulmasını sürətləndirən bir sıra amillər vardı. "Haşimi işi"ndə Türkiyə və KMR-nin oxşar mövqeləri və kürd muxtariyyatı rəhbərliyinin Haşimini N.Malikinin hökumətinə verməkdən imtina edərək qarşılıqlı anlaşmanın güclənməsinə kömək etdi. Kürd muxtariyyətinin mərkəzi hökumətlə güc və neft gəlirləri ilə əlaqədar münaqişələri buna gətirdi ki, Ankara və Ərbil səngərin bir tərəfində olduğunu göstərdi. Türkiyə ilə Kürd Muxtar qurumu arasındakı əlaqələrin inkişafına təkan verən digər bir amil, Ankaranın İraqdakı təsirinin artmasını "tarazlaşdırma" istəyi idi.

Tehran və Bağdadın Suriyadakı hadisələrlə bağlı həmrəyliyi Ankaranın İraqdakı təsirini gücləndirmək istəyinə əlavə təkan verdi. Ankara Şimali İraqdakı PKK döyüşçü düşərgələrinin saxlanmasından məmnun olmadığını ifadə etdi. Eyni zamanda Erbili qıcıqlandıran transsərhəd əməliyyatlar edəcəyini bildirdi (1). Türkiyə və Kürdüstan Muxtariyyatının dialoqun dərinləşməsində marağı Suriyadakı hadisələrlə və Ərbilin birbaşa əlaqələr saxladığı Suriyadakı kürdlərin gələcək taleyinin qeyri-müəyyənliyi ilə bağlı idi. Ankara ilə Erbil arasındakı siyasi əlaqələrin inkişafı R.T.Ərdoğan hökumətinin Türkiyədəki kürd problemini həll etməsinə, PKK terrorçularının Türkiyədən Şimali İraqa çıxarılması ilə bağlı razılığa gəlmələrinə təkan verdi (14,s.44). 2014-cü il noyabrın 5-7-i tarixlərində İraqın Xarici işlər naziri İbrahim El-Cəfərinin Türkiyəyə etdiyi ziyarətin ardından, Baş nazir Əhməd Davudoğlu 20-21 noyabr tarixlərində İraqa səfər etdi.

İbrahim El-Cəfərinin Türkiyə ziyarətinin son günündə (7 noyabr 2014) IKBY Təbii Sərvətlər Nazirliyi avqust ayında gündəlik olaraq təxminən 185 min barrel xam neftin IKBY-dən Türkiyəyə göndərildiyini, bu rəqəmin noyabr ayında 300 min barelə çatdığını açıqlamışdır.Bu şərh IKBY ilə Türkiyə arasındakı enerji əməkdaşlığın İraq mərkəzi hökuməti tərəfindən də qəbul edilmişdir. Bu şərhdən bir həftə sonra Bağdad və Erbil, IKBY-nin çıxardığı neftdən günlük 150 min barrel neftin

Bağdad üzərindən satışı məsələsində anlaşmışdır. Edilən bu razılaşma və son müddətdə yaşanan irəliləyişlər, Türkiyə, İraq mərkəzi hökuməti və Kürdüstan Muxtariyyatı arasında üçlü bir enerji əməkdaşlığının ortaya çıxma ehtimalını də artırmaqdadır.

Türkiyənin İraqla əlaqələrindəki yumşalma meyli, birbaşa Ankaranın xarici siyasət konsepsiyasının dəyişməsi ilə əlaqəli görünür. 2016-cı ilin iyun ayında prezident Rəcəb Tayyib Ərdoğanın yeddi ay böhran yaşadığı Rusiya ilə və beş ildən çoxdur ki, diplomatik əlaqə içində olmadığı İsraillə barışmaq üçün eyni vaxtda cəhdlərə başlaması, xarici siyasətdəki dönüşün mesajlarını verdi. Baş nazir Ərdoğanın və Baş nazir B.Yıldırımın bu siyasi gedişlərinin “xarici siyasətdə normallaşma” və “dostları artıran, düşmənləri azaldan bir xarici siyasət” olaraq ifadə edilməsi (3) oldu. 2017-2018-ci illərdə Türkiyənin İraq siyasəti bunu bir daha sübut etdi.

Belə ki, 25 sentyabr 2017-ci ildə İraq Kürd Regional Hökuməti (KRG), qeyri-qanuni bir referendumdan sonra Türkiyə-İraq münasibətləri daha yüksək bir səviyyəyə çatdı. Belə ki, referenduma hər iki tərəfin ortaq mövqe göstərməsi tərəfləri daha da yaxınlaşdırdı. İraqda mayın12-də edilən ümumi seçkilərdən sonra Abdulmehdinin Baş nazir və Salehin prezident seçilməsi, Türkiyə-İraq münasibətlərində yeni bir mərhələnin önünü açdı. İraqın keçmiş baş naziri Haid əl-İbadi dövründə ikitərəfli münasibətlərdəki müsbət inkişaf meyli Abdulmehdinin gəlməsi ilə davam etdi (10).

İraq Kürdüstanında sözdə "müstəqillik" referendumundan sonra ikitərəfli əlaqələr, İraqda terror təşkilatı İŞİD-in aradan qaldırılması, Türkiyənin bu ölkənin yenidən bərpası üçün 5 milyard dollarlıq kredit təqdim etməsi və qarşılıqlı ticarət həcminin artırılması üçün Ovaköy Sərhəd darvazasını açmağa cəhd etməsi ilə və Kərkük neftinin 1 ildən sonra yenidən Türkiyə üzərindən ixrac edilməyə başlanması sayəsində güclü irəliləyişlər əldə etdi.Üstəlik Türkiyə PKK-nın fəaliyyətlərinə göz yumulması və təşkilatın sözdə siyasi qanadı olan Tevgera Azadinin fəaliyyətinə reaksiya olaraq Kürdüstan Vətənpərvərlər Birliyinin (KYB) Ankaradakı ofisinə kilid vurdu və Süleymaniyyə istiqamətli uçuşlarda hava sahəsini bağladı.

Beləliklə, TR XİN-in rəsmi saytında qeyd edildiyi kimi, Türkiyə üçün qonşu İraqda daimi sabitlik və təhlükəsizliyin təmin edilməsi vacibdir. Bu baxımdan, İraqın federal və demokratik sistemə çatması, sərhədləri daxilində sözün tam mənasında suverenliyini və birliyini təmin edərək, torpaqlarında yuva salan və Türkiyəni “təhdid edən terror təşkilatlarını neytrallaşdırması ən birinci gözləntilərimizdir” (7).

Türkiyə, İraqın birlik və bütövlüyünü dəstəkləməkdədir. İraqın gələcəyi ilə bağlı hər cür qərarın İraq Konstitusiyası maddələri çərçivəsində, əlaqədar bütün tərəflərin və İraq xalqının razılığı alınaraq, dialoq və razılaşma şəklində həllinin gərəkliyinə inanır. İraqda konstitusiya və qanunun aliliyini pozan hərəkətlər və yanaşmalardan ciddi şəkildə uzaq durulmalıdır. Türkiyə 25 sentyabr 2017-ci ildə KRG tərəfindən keçirilən qanunsuz referenduma da bu anlayışla etiraz edildi. Bu prosesdə Türkiyə İraqın suverenliyini, ərazi bütövlüyünü və siyasi birliyini qorumaq üçün İraq hökuməti ilə yaxın işbirliyi içində hərəkət etmişdir.

Qeyd edildiyi kimi, 2014-cü ildə İŞİD terror təşkilatı İraq ərazisinin təxminən üçdə birini işğal etdi. Türkiyə, Beynəlxalq Koalisyonun bir üzvü olaraq İraqın İŞİD terror təşkilatı ilə mübarizəsinə də böyük dəstək vermişdir. 9 dekabr 2017-ci ildə İraq Baş naziri Ebadi İŞİD üzərində hərbi qələbəni elan etdi. Türkiyə, İraqın İŞİD-dən qurtarılan bölgələrinin yenidən abadlığı, yaşayış yerlərini tərk edənlərin geri dönüşlərini və digər müxtəlif strateji layihələri dəstəkləmək üçün 5 milyard ABŞ dolları məbləğində kredit verdi və 50 milyon ABŞ dolları məbləğində yardım etdi (7).

Beləliklə, iki ölkə arasında Yüksək Səviyyəli Strateji Əməkdaşlıq Şurası (YDSK) 10 iyul 2008-ci ildə Bağdadda imzalanan Birgə Siyasi Bəyannamə ilə təsis edilmişdir. YDSK mexanizmi iki ölkənin ortaq layihələri əsasında əməkdaşlığı inkişaf etdirməyi hədəfləyir. İlk YDSK konfransı 15 oktyabr 2009-cu ildə Bağdadda keçirildi. YDSK-nin 25-26 dekabr 2014-cü ildə Ankaradakeçirilən II Konfransı iki ölkə arasındakı əlaqələrin böyük əhəmiyyət daşıdığı vurğulanmışdır. 7-8 yanvar 2017 tarixlərində Bağdadda keçirilən YDSK-nin III Konfransında tərəflər bir-birinin ərazi bütövlüyünə və müstəqilliyinə hörmət eşitdiklərini bəyan etdi, ikitərəfli əlaqələrin hər sahədə inkişaf etdirilməsi və terrorla mübarizədə əməkdaşlığı davam etdirilməsi məsələlərində razılığa gəldilər.

İraq prezidenti Berhan Salehin 3 Yanvar 2019 tarixində Türkiyəyə səfəri zamanı ikitərəfli əlaqələrin hərtərəfli inkişaf etdirilməsinin və bütün terror təşkilatlarına qarşı mübarizədə əməkdaşlığın artırılmasının vacibliyi xüsusi olaraq vurğulandı.

Ümumiyyətlə, Türkiyə İraqın dövlət quruculuğunda mühüm rolu olan və bu ölkə ilə arasında bir dostluq körpüsü olaraq hesab etdiyi türkmənlərin vəziyyətini yaxından təqib edir və İraqın birliyini təmin edən türkmən cəmiyyətinin qarşılaşdığı problemlərin davamlı həlli üçün İraq səlahiyyətliləri ilə təmas içindədir. Türkiyə həmçinin türkmənlərin ölkənin rəhbərliyində daha çox yerə sahib olması lazım olduğunu düşündüyünü ifadə edir.

Beləliklə, PKK terror təşkilatının İraqdakı varlığı Türkiyənin milli təhlükəsizliyini və İraqın suverenliyini təhdid etməkdədir. Əslində İraq Konstitusiyasının 7-ci maddəsi İraq hökumətini, İraq ərazisində qonşu ölkələri təhdid edən terror təşkilatlarını qəbul etməməyi tələb edir. Türkiyə bu maddəni İraq orqanları yerinə yetirmədiyi təqdirdə, beynəlxalq hüquqdan qaynaqlanan qanuni müdafiə haqqı çərçivəsində, milli təhlükəsizliyini qorumaq üçün lazımlı gördüyü bütün tədbirləri həyata keçirəcəkdir.

## References

1. Foreign Minister Davutoğlu met with KRG Prime Minister Barzani // Republic of Turkey. Ministry of Foreign Affairs : office. website. 2013. 30 July
2. Foreign Minister Davutoğlu's statement on Syria sanctions // Hürriyet newspaper, 2011, 30 November. http://www.hurriyet.com.tr/planet/19360440.
3. Duman B. Turkey-Iraq relations where stands now?// http://www.aljazeera.com. En /gorus/turkey-iraq-relations-from-where-to
4. Erdogan's harsh response to Maliki // Milliyet newspaper : website. 2012. April 21. http://siyaset.milliyet.com.tr/ erdogandan -maliki -ye-cok-sert-yanit/siyaset/ policydetay / 21.04.2012/1531315/default.htm
5. About the Interview Given by Iraqi Prime Minister Nouri al-Maliki to a Television Channel: № 31 //. website. 2013. February 5th. http://www.mfa.gov.tr/
6. Flight from THY to Erbil // Sabah newspaper: website. 2010. 3 June. http://www. morning.com.tr/Ekonomi /2010 /06 /03/thyden_erbile_sefer
7. Turkey - Iraq Political Relations // http://www.mfa.gov.tr/turkiye-irak-siyasi-iliskileri.tr.mfa/
8. Joint political declaration on the establishment of the High Level Cooperation Council between the Governments of the Republic of Turkey and the Republic of Iraq //http://www.mfa. gov.tr/data/
9. 'Violation warning' to Turkey // Milliyet : website. 2012. 17 July./: http:// dunya. milliyet.com.tr/iraq-hava-sahasini-turkiye-ye-kapatti/dunya/dunyadetay/ 17.07. 2012/1568055/default.htm
10. A new era in Turkey-Iraq relations// https://www.aa.com.tr/tr /dunya/turkiye-irak-iliskisinde-yeni-donem-/1354245
11. Zeyrek D. A buffer zone can be established in Syria / Deniz Zeyrek // Radikal newspaper: website.2011. June 11th: http://www.radikal.com.tr/dunya/suriyede_ tampon_bolge_kurukazan-1052433
12. The Arab League impose an economic blockade of Syria // BBC Russian Service: Internet site. 2011.27 November / http://www.bbc.co.uk/russian/ international / 2011/11 / 111127_arab_league_syria_sunctions_vote.shtml
13. RF and Iraq against interference in the Syrian conflict // RIA Novosti: inform. agency. 2012.10 October. http://ria.ru/arab_sy/20121010/771063585.html#13752759108244 & message = resize & relto = login & action = remo veClass & value = registration
14. Svistunova I. Turkish-Iraqi relations in conditions of regional instability // Problems of national strategy № 6 (21) 2013, s.38-54

**Rəyçi: prof. H.N.Məmmədov**

Göndərilib: 30.11.2021 Qəbul edilib: 19.12.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/73/48-52

**Arzu Ağanəhmət qızı Mirzəyeva**
Azərbaycan Tibb Universiteti
müəllim
Mrs.arzu1960@gmail.com

# QOŞMALARLA İFADƏ OLUNAN FEİLİ İDİOMLAR

**Xülasə**

İdiomlar dilşünaslıqda sabit söz birləşmələri, frazeoloji birləşmələr, frazeologizmlər və s. adlar altında verilmişdir. İdioma yunan mənşəli sözdür. Mənası özünəməxsus xüsusiyyətlərə malik ifadə deməkdir. Həqiqi mənalı sözlərin qarşılığı olub onu məcazi məna ilə birləşdirən sabit söz birləşməsinə idiom deyilir. İdiomların ifadə etdiyi məfhum isə başqa söz birləşmələrinə nisbətən daha konkret olur. İdiomlar sözün ekvivalenti, yəni məcazi məna ilə verilən sinonimi kimi dildə özünü göstərir. İdiomlar milli xüsusiyyətlərə malik olduğuna görə hər bir xalqın dilindəki idiomları öyrənməklə həmin xalqın mədəniyyəti, tarixi və yaşayış tərzi ilə yaxından tanış olmaq mümkündür.

İdiomların əsas xüsusiyyətlərindən biri də onların obrazlı emosional ifadələr olmasıdır. Onlar hər hansı bir anlayışı ayrı-ayrı sözlərdən dəfələrlə təsirli və obrazlı əks etdirir. İdiomların özünəməxsus kateqoriyaları onu digər dil vahidlərindən fərqləndirir. İdiomlar dilin orijinal vasitəsi, varlığı və zənginliyidir. diomların belə maraqlı xüsusiyyətləri dilçiliyin müxtəlif sahələri ilə məşğul olan alimləri – leksikoqrafları, üslubiyyatçıları, qrammatikləri, folklorşünasları da çox düşündürmüş və onları elmi təhhqiqat işlərinə cəlb etmişdir. Azərbaycan dilində idiomlar ismi və feili olmaqla 2 qrupa bölünür.
***Açar sözlər:*** *Qoşma, feili birləşmə, idiom, məcazi məna, obrazlılıq, ifadəlilik*

**Summary**

Idioms in linguistics are given under the word combinations, phraseological combinations, phraseologisms, etc. An idiom is a word of Greek origin. It means an expression with its own characteristics. An idiom is a combination of words that have a real meaning and combine it with a figurative meaning. The concept expressed by idioms is more specific than other word combinations. Idioms manifest themselves in language as the equivalent of a word, that is, a synonym given in a figurative sense. Because idioms have national characteristics, it is possible to get acquainted with the culture, history and way of life of each people by studying the idioms in the language of each nation.One of the main features of idioms is that they are figurative emotional expressions. They often express any concept more effectively and figuratively than individual words. Certain categories of idioms distinguish it from other language units. Idioms are the original means, existence and richness of language. Such interesting features of idioms have made scientists of different fields of linguistics - lexicographers, stylists, grammarians, folklorists think a lot and involved them in scientific research. Idioms in the Azerbaijani language are divided into 2 groups, including nouns and verbs.
***Key words:*** *postposition, verb combination, idiom, figurative meaning, figurativeness, expressiveness*

İdiomların leksik-semantik mənaları çox maraqlıdır. Onlar xalqın məişət və həyat tərzini əks etdirir. Məsələn: ***keçiləri ilə oynamaq, qarışqadan fil düzəltmək*** və s.

İdiomların leksik, semantik modellərinə nəzər salaq.

1.Danışığın istiqamətini göstərən semantik model: ***gözünün içinə demək, heç kəsin toyuğuna kiş deməmək, aşağı oturmaq, göylərdə uçmaq, sözünü yerə salmaq, burnunu sallamaq, burnunu dik tutmaq*** və s.

2.Danışığın keyfiyyətini göstərən semantik model: ***havayı danışmaq, uzun-uzadı danışmaq*** və s.

3.Danışığın obyekti ilə əlaqəli semantik model: ***bir qarışqanı da öldürməz, xoruz səsi eşitməmiş*** və s.

4.Təfəkkürün keyfiyyətini göstərən semantik model: ***zurna-balabanla qaldırmaq*** və s.

5.Təfəkkürün obyekti ilə əlaqədar semantik model: ***cikini də, bikini də bilmək*** və s.

6.Somatik idiomlarla göstərilən semantik model: ***göz açmaq, başa düşmək, dil vermək, burnunu sallamaq, ağız açmaq, ürəyi açılmaq, əl tutmaq, qulaq asmaq, dişi bağırsağını kəsmək, ayağı yüngül olmaq*** və s.

Qoşmalı feili birləşmələr qoşmaların köməyi ilə yaranır. Qoşma bu birləşmələrin tərəfləri arasında əsas əlaqələndirici vasitə hesab olunur. Eyni zamanda qoşmalar feili birləşmənin tərəfləri arasında qrammatik əlaqə yaradır, ayrı-ayrı sözlərin birləşərək söz birləşməsi yaratmasına kömək edir. Məsələn: ***quş kimi uçmaq, sənin üçün yaşamaq*** və s.

Qoşmalar feili birləşmələrin tərəflərinin məna əlaqəsinin yaranmasında fəal iştirak edir. Məsələn: ***at kimi getmək, at ilə getmək, at üçün gəlmək*** və s.

Bunlar göstərir ki, qoşmalı feili birləşmələrin dəqiq və ətraflı öyrənilməsi üçün qoşmaların müəyyənləşdirilməsi və öyrənilməsi, onların işlənmə yerlərinin və məna əlaqələrinin yaranmasındakı tədqiqi lazımdır. Bir sıra mübahisəli məsələlərin hələ də qalmasına baxmayaraq, türk dillərində qoşmaların əsas xüsusiyyətləri öyrənilmişdir.

Azərbaycan dilçiliyində M.Hüseynzadənin (5), C.Cəfərovun (1), C.Əfəndiyevin (2), F.Zeynalovun (10) qoşmalar haqqındakı tədqiqləri burada tədqiqlərə dair bəhs açmaq ehtiyacını aradan qaldırır və bu sahədə bizə əhəmiyyətli kömək göstərir.

Qoşmalar feili birləşmələrdə nə qədər ciddi əhəmiyyətə malik olsalar da, onlar birləşmələrdə ancaq köməkçi vasitə olaraq qalır və söz birləşmələrinin komponentlərini təşkil edən əsas sözlərin əhəmiyyətini azaltmır. Birləşmələrin məna əlaqələrinin yaranmasında komponentləri əmələ gətirən əsas sözlərin leksik mənaları qrammatik formaları da mühüm əhəmiyyət kəsb edir (9).

Qoşmalı feili birləşmələri müxtəlif prinsiplər əsasında təsnif etmək olar. Bu birləşmələri birinci tərəfdəki müstəqil mənalı sözlərin qrammatik formasına əsasən qruplaşdırmaq daha münasibdir. Bu nöqteyi-nəzərdən qoşmalı feili birləşmələrdə ilk növbədə iki əlamət diqqəti cəlb edir:

1. Bu birləşmələrin birinci tərəfdəki əsas söz şəkilçisiz olur: məsələn, ***adam kimi yaşamaq, uşaq kimi ağlamaq, kinayə ilə danışmaq*** və s. Belə birləşmələrin tərəflərinin əlaqələnməsində qoşmalar yeganə vasitə olub, tərəflərini məna əlaqələrində daha fəal iştirak edir.

2. Bu birləşmələrin əsas qismində birinci tərəfdəki söz qoşma ilə işlənməklə yanaşı, özü də hal şəkilçiləri qəbul edir: ***sənin kimi oxumaq, məktəbə sarı baxmaq, evdən ötrü darıxmaq*** və s.. Birləşmələrin bu növlərində əlaqə vasitələri bir növ qoşalaşır, qoşmalarla yanaşı hal şəkilçilərindən də istifadə edilir. Burada qoşmalar birləşmənin tərəfləri arasında əsas əlaqələndirici vasitə olmaq rollarını saxlasalar da, məna əlaqələrinin yaranmasında onların rolu bir qədər zəifləyir, onlar az da olsa, bu cəhətdən hal şəkilçilərinə güzəştə getməli olurlar.

Qoşmalı birləşmələrin birinci tərəfindəki sözlər ancaq yiyəlik, yönlük və çıxışlıq hal şəkilçiləri qəbul edə bilir.

Bu vəziyyət ismin hallarının qoşmalarla əlaqəsindən irəli gəlir, ona görə də bu sistemdə birinci tərəfi təsirlik və yerlik hallarda olan birləşmələr qeyd oluna bilmir, çünki türk dillərində, eləcə də Azərbaycan dilində bu hallarla işlənən qoşmalar yoxdur. Qoşmaların hansı hallarla işlənməsi məsələsi türkologiyada müəyyən dərəcədə mübahisəyə səbəb olmuş qoşmaların təsirlik və yerlik hallarda işlənə bilməsi fikri də irəli sürülmüşdür Lakin bu fikirlər dil faktları ilə sübut olunmur (9).

Bütün bunları nəzərə alıb, qoşmalı feili birləşmələri dörd yerə ayırmaq mümkündür. 1) birinci tərəfi heç bir şəkilçi qəbul etmədən işlənənlər; 2) birinci tərəfi yiyəlik hal şəkilçisi qəbul edənlər; 3) birinci tərəfi yönlük hal şəkilçisi qəbul edənlər; 4) birinci tərəfi çıxı.lıq hal şəkilçisi qəbul edənlər. Birinci və ikinci qrupa daxil olan birləşmələr bəzi spesifik cəhətləri ilə daha çox diqqəti cəlb edirlər. Üçüncü və dördüncü növdə olan birləşmələrin birinci tərəfləri hallana bilən bütün sözlərlə ifadə oluna bildikləri halda, birinci növdəki birləşmələrin birinci tərəfləri əvəzliklər, xüsusən şəxs əvəzlikləri ilə ifadə oluna bilmir. İkinci növ birləşmələrinin birinci tərəfləri yalnız əvəzliklərlə ifadə olunur. Məsələn: ***lalə kimi oxumaq, sənin kimi oxumaq, Lalə üçün çalışmaq, sənin üçün çalışmaq.***

Yaratdıqları məna çalarlarına görə qoşmaların məna növləri var:

1) İsmin adlıq, yiyəlik halında işlənən –ila (-la2), -ca2 birgəlik vasitə yaradır. Eyni hallarda işlənən **kimi, qədər, tək, təki, -ca$^2$** bənzətmə mənası yaradır.

2) Yönlük halda işlənən qoşmalar ***kimi, qədər, tək, -can***[2] məsafə mənası yaradır. Eyni halda işlənən qoşmalar ***sarı, tərəf, doğru, qarşı*** istiqamət mənası yaradır.

Yönlük halda işlənən bəzi qoşmalar: ***dair, aid, xas, məxsus,*** aidlik mənası yaradır.

3) Çıxışlıq halda işlənən qoşmalar: ***əvvəl, qabaq, sonra, bəzi,*** zaman mənası yaradır. Eyni halda işlənən bəzi qoşmalar: ***başqa, savayı, özgə, qeyri, əlavə*** fərqləndirmə mənası yaradır.

Yiyəlik, yönlük, çıxışlıq halda işlənən bəzi qoşmalar: ***üçün, görə, ötrü, sarı, üstündə, uğrunda, naminə*** və s. səbəb və məqsəd mənası daşıyır.

Qoşmanın mənşəyi, daşıdığı vəzifə və ifadə etdiyi məna tarixi inkişaf nöqteyi nəzərindən öyrənilməyə ehtiyacı olan məsələlərdəndir. Çünki bu nitq hissəsi öz söz ehtiyatının azlığı cəhətdən bütün nitq hissələrindən kiçik olsa da, öz əhəmiyyəti etibarı ilə demək olar ki, başqalarından heç də geri qalmır (1).

Qoşmaların bir sıra xüsusiyyətləri vardır. Belə ki, qoşmaların təklikdə müstəqil mənası yoxdur. Heç bir suala cavab vermir. Müstəqil cümlə üzvü ola bilmir. Qoşulduğu sözlə birlikdə cümlə üzvü olur. Qoşmalar sözlərə qoşulduqdan sonra müxtəlif mənalara malik olur (5).

İsmin müəyyən hal şəkilçisindən sonra gəlmiş qoşma hal şəkilçisinin ifadə etdiyi ümumi qrammatik mənanın konkretləşməsinə və daha dəqiq ifadə olunmasına yardım edir (7).

Qoşmaların feili birləşmələrlə, daha doğrusu, idiomlarla işlənməsi çox maraqlıdır. Çünki idiomlar nitqdə emosionallıq, obrazlılıq və ifadəlilik yaradan ən təsirli vasitələrdən biridir. Məcazi məna kəsb edən bu birləşmələrin nitqdə yaratdığı çalarlıq, obrazlılıq onların qarşılığı olan leksik sinonimlərdən daha qüvvətlidir. Məsələn: ***danışmaq – söz açmaq; doğulmaq – dünyaya gəlmək; ölmək – dünyasını dəyişmək; incimək – üz çevirmək; gedib-gəlmək – ayaq döymək; tutulmaq - ələ keçmək; yaşamaq – ömür sürmək; bezmək – cana gəlmək*** və s.

Dilimizdəki idiomlar istər forma, istərsə də məzmunca olduqca zəngindir. Onlardan danışıq prosesində bütövlükdə nitqi qüvvətləndirmək, məna rəngarəngliyi və ifadəlilik yaratmaq məqsədilə tez-tez istifadə olunur. Məsələn: ***canını boğazına yığmaq, kirpiyi ilə od götürmək, qayğı göstərmək, quşu gözündən vurmaq, aranı qarışdırmaq*** və s. Bu birləşmələr nə qədər yerli-yerində işlədilsə, nitq bir o qədər zəngin və maraqlı olar.

Nitqi zənginləşdirən sinonim idiomlardan bir neçəsini misal göstərək: ***Yorulmaq-əldən düşmək, haldan düşmək, nəfəsi kəsilmək, taqətdən*** düşmək və s.

***Gözləmək - gözünün kökü saralmaq, gözü yolda qalmaq.***

***Düşünmək – fikrə getmək, xəyala dalmaq, fikir dəryasına qərq olmaq.***

***Kömək etmək - əl tutmaq, karına gəlmək, kömək əlini uzatmaq, qanadının altına almaq*** və s.

Antonimlik yaradan idiomlar: ***özünü dartmaq – başıaşağı olmaq; dili tutulmaq – dil-dil ötmək; göz yummaq - əhəmiyyət verməmək; göz yummaq – ölmək*** və s.

Dildə frazeoloji ifadə (idiomların) və ibarələrin işlənməsi insanların zəngin həyat təcrübəsi ilə bağlıdır. Çünki heç vaxt kortəbii və təsadüfi şəkildə bu cür frazeoloji ifadələr dilə gəlmir. İnsan həyatı boyu müxtəlif hadisə və əhvalatlarla qarşılaşır və bunlardan nəticə çıxararaq onu öz nitqində obrazlı şəkildə ifadə etməyə çalışır. Məsələn: Azərbaycan dilində işlənən ***"Daldan atılan daş topuğa dəyər"*** ifadəsi ***"Hər işi vaxtında görmək"*** mənasında dədə-babalardan miras qalmışdır (6, 227).

Azərbaycan dilindəki idiomların bir qismində qoşmalar iştirak edir. ***Kimi*** qoşmasının iştirakı ilə əmələ gələn idiomlar bir qayda olaraq bənzətmə mənası əmələ gətirir. Belə idiomların aşağıdakı struktur tipləri var:

1.***Kimi*** qoşması ilə işlənən isimlə feillərin birləşməsi yolu ilə - Rpk+V: ***quş kimi qanad çalmaq, ilan kimi qabıq qoymaq, kömür kimi qaralmaq, kölgə kimi izləmək, qarğa kimi qaralmaq, xəncər kimi ürəyinə saplanmaq, Fərhad kimi külünc çalmaq, pərvanə kimi başına fırlanmaq*** və s.

Ancaq gərək külfətin sözü külfətin öz içində qalsın, ***quş kimi dışarıda qanad çalmasın*** (8, 58). Biz ***ilan kimi qabıq qoyuruq***, kolxoz qururuq, ferma yaradırıq, ancaq mərkəzdəkilər bizim qərarımıza belə barmaqarası baxırlar (8, 108). Əmi, o qızıldan qiymətli başın üçün, düşüb dalımca pusquya, ***kölgə kimi izimdən üzülmür*** (8, 127). Balış alqışlandığı zaman əgər bir kəs dönüb anbardara baxırdısa , ***o kömür kimi qaralır***, başını gizlətməyə yer tapmırdı (8, 51). Beləliklə, o hər tərəfə sədaqət göstərib tez-tez bir cilddən o biri cildə girib uyğunlaşır, Mehmanı gördükcə bir ***kirpi kimi yığılıb*** müti bir sifət alırdı (8,

134). Gecənin zil qaranlığında Mehmanın öz evindən belə hirsli-hikkəli çıxıb getməsi Şəhla xanımın ***ürəyinə zağlı bir xəncər kimi saplandı*** (8, 342). ***Fərhad kimi külüng çalıb***, çayın üstündəki sıldırım göy qayanı parça-parça eləyib yardıq (8, 329). Keçmiş prokuror sürüşüb girdi rüşvətin qara lehməsinə, özünü də ***qarğa kimi qapqara qaraltdı!*** (8, 119). Vallah, biz hamımız elə Züleyxa xanımın ***başına gecə də, gündüz də pərvanə kimi fır-fır fırlanırıq*** (8, 187).

2. Birinci növ təyini söz birləşməsinə kimi qoşmasının və feillərin əlavəsi ilə: SB1+Pk+V – ***xam dayça kimi atılıb-düşmək, quduz it kimi yan-yörəsini tutmaq*** və s.

Mehmangildə düzəltdikləri zəfəran plov qonaqlığın baş tutmadığından sonra Məmmədxan geriyə dönüb Balışı evdə görməyincə ***cini kəlləsinə çıxmış,*** necə deyərlər, kəfəni boynuna dolayıb mır-mır mırıldanmış, ***quduz it kimi yan-yörəsini tutmağa başlamışdı*** (8, 283). Yoxsa indi o ***xam dayça kimi atılıb-düşür,*** kəməndə gəlmir, fınxırır

3. İkinci növ təyini söz birləşməsinə ***kimi*** qoşması və feillərin əlavəsi ilə: SB2+Pk+V – ***iynə ulduzu kimi daralmaq, nanə yarpağı kimi əsmək, göz bəbəyi (göz giləsi) kimi qorumaq, saman çöpü kimi axmaq, hörümək toru kimi bürümək*** və s.

İnqilabi qanunçuluğun müqəddəsliyini ***göz bəbəyi kimi qorumaq lazımdır.*** (8, 285). Siz Şura hökumətini də, onun sizə tapşırılan qanununu da ***göz giləsi kimi qoruyun!*** (8, 103). Nəfəsi təngişən, geniş dünya ***iynə-ulduzu kimi başına daralan.*** Məmmədxan qayıdıbqapısına söykəndi (8, 211). Xatun Vahid oğlunun üstündə, necə deyərlər, ***nanə yarpağı kimi əsirdi*** (8, 56). Çünki olar səni ***hörümçək toru kimi bürümək*** istəyirlər (8, 277). Son məğlubiyyətini görən, güclə çaya düşüb ***saman çöpü kimi*** axdığını təsəvvürə gətirən Murtuzov haray salıb bağırdı (8, 353).

4. Üçüncü növ təyini söz birləşməsinə ***kimi*** qoşması və feillərin əlavəsi ilə: SB3+Pk+V - ***əlinin içi kimi (ovcunun içi kimi)*** bilmək.

Bilirəm, çox əcəbcə ***əlimin içi kimi bilirəm*** (8, 110). Nədən ki bizim Murtuz bu dünyanın alt-üstünü ***ovcunun içi kimi biləndir*** (8, 137).

5. ***Kimi*** qoşması ilə işlənən isimlərə sifətlərin birləşməsi ilə - Npk+A – gül kimi ləkəsiz, gül kimi təmiz və s.

Kişi gərək ***ləkəsiz olsun, gül kimi*** (8, 19). Bir az hirsli və dəymədüşər qocadır, ancaq vicdanı ***gün kimi təmizdir*** (8, 281).

6. İkinci növ təyini söz birləşmələrinə ***kimi*** qoşmasının və sifətin birləşməsi ilə - ***əl içi kimi apaydın, bünövrə daşı kimi bəd olmamaq, iynə ulduzu kimi balaca*** və s.

Hər şey göz qabağında ***əl içi kimi apaydın*** görünür (8, 351). Ancaq bu qızıl saat heç də bir ***bünövrə daşı kimi bəd deyildir*** (8, 179). Əgər bir ürəyə bir ***iynə ulduzu kimi*** balaca bir ləkə düşərsə, o adamın gözəl sifətlərinə də kölgə salar (8, 333).

7. Qarışıq tipli birləşmələrə ***kimi*** qoşmasının əlavəsi ilə: ***tamahı qılınc kimi itilənmək, işi kələf kimi dolaşmaq, yetim quzu kimi boynunu burmaq, yoluq cücə kimi qanadlarını sallamaq, toyuq kimi bir ayaq üstdə durmaq*** və s.

*Əgər burada göstəriləcək bir pyesdə bir neçə qadın rolu olurdusa, onda da biçarə Əbdülsalamyetim* **yetim quzu kimi boynunu burur**, *əl-ayağını döşünə yığırdı* (8, 159). *Züleyxa baxır, onun ağzı sulanır, tamahı* **qılınc kimi itilənirdi** (8, 168). *Dünən yumurtadan çıxan cücə gəlib bura, düşüb inqilabın ilk günündən bünövrəsi burada qoyulan icraiyyə komitəsinin qərarlarının üstünə, sən də orada* **yoluq cücə kimi qanadlarını sallaya-sallaya** *cükgüldəyirsən* (8, 110). *Bizim anamız quru çörəkdən də bizi qoruyur, həmişə "Oğul, artıq tamah baş yarar" deyə* ***toyuq kimi bir ayaq üstə durur***.(8, 168).*Axırda* ***işi kələf kimi dolaşdırıb*** *özü də açılmaz bir dolaşığa düşdü* (8, 53).

8. Qarışıq tipli birləşmələrə **kimi** qoşmasının və feili sifətinin əlavəsi ilə - ***ilanın zəhləsi yarpızdan gedən kimi, süd içindən çıxan milçək kimi, dəvə nalbənddən ürkən kimi, cin dəmirdən qorxan kimi, quzğun cəmdək üstünə dolanan kimi, üstünə çalağan şığıyan yetim cücü kimi*** və s.

Heç Bayraməlisiz də toy olar? ***Dünyada ilanın zəhləsi yarpızdan gedən*** **kimi,** mənim də zəhləm müftədən gedər (8, 130). Odur, fikir dağılanda baxırsan ki, gözlənilmədən işin içindən ***süd içindən çıxan milçək kimi*** bir milçək çıxanda adamın ürəyi bulanır (8, 350). Demək, Kamilov komsomolun tənqidindən ***dəvə nalbənddən ürkən kimi*** ürkür? Dəvədən də artıq, ***cin dəmirdən ürkən kimi!*** (8, 350).

Görünür ki qayınanandan yamanca qorxursan, ***lap cin dəmirdən qorxan kimi!*** (8, 350). Yevlaxa gələnlərə faytonçular göz verir, işıq verməyirlər, adamın üstünə ***quzğun cəmdək üstünə dolanan kimi*** dolanırlar (3,85). Murtuzov ***üstünə çalağan şığıyan yetim cücü kimi*** sığınmaq üçün özünə kol da tapmadı (3, 110).

## References

1.Jafarov S.A. About suffixes of the Azerbaijani language. News of the Academy of Sciences of the Azerbaijan SSR 1956, № 4;
2. Afendiyev J. Attachment. Grammar of the Azerbaijani language. I h. 1951;
3. Hagverdiyev A. Receipt of Paradise. Baku, Azerneshr, 1986;
4. Huseynzade F. Additions in modern Turkish languages. Baku, 1964;
5. Huseynzade M. Modern Azerbaijani language 1963;
6. Gurbanov A. General linguistics. Maarif Publishing House Baku, 1989, p. 227;
7. Mirzazade M. Historical morphology of the Azerbaijani language. Baku, Azerneshr, 1962, 298-299;
8. Rahimov S. Selected works, Volume 5. Baku, Azerneshr, 1986;
9. Seyidov Y. Phrases in the Azerbaijani language. Baku University Publishing House, 1992;
10. Zeynalov F. Additions in modern Turkic languages. Baku, 1964, p. 13.
11.http://afadqurbanov.az/books/6.%20M%C3%9CAS%C4%B0R%20AZ-N%20%C6%8FD%C6%8FB%C4%B0%20D%C4%B0L%C4%B0_maket_Sayfa-454.pdf
12. https://mehmanmusayev.com/pdf/kb_4.pdf

**Rəyçi: dos. X.Məhərrəmova**

Göndərilib: 01.12.2021 Qəbul edilib: 21.12.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/73/53-57

**Kifayət Qurban qızı Mənsimova**
ADPU nəzdində Pedaqoji Kollec
müəllim
kifayetmnv@gmail.com

# TƏRBİYƏ PROSESİNDƏ MÜƏLLİM ŞƏXSİYYƏTİNİN ROLU

**Xülasə**

Pedaqogikanın vacib tərbiyə metodlarından biri də nümunədir. Pedaqogikada bu həm metoddur, həm də tərbiyə vəsitəsidir. İlk olaraq tərbiyəçinin şəxsi nümunəsi haqda danışmaq lazımdır. Çünki tərbiyəçinin şəxsi nümunəsinin və onun uşaqların formalaşan psixologiyasına təsiri haqda məhşur pedaqoqlar və psoxoloqlar hər zaman yazmışlar. Tərbiyəçi, bilavasitə öz yetişdirmələrinə təsir göstərən, onları həyata hazırlayan, müsbət keyfiyyətlər aşılayan bir şəxsiyyət olaraq insanlar arasında böyük nüfuza sahib olmalıdır.

Bu mənada müəllimin özünün bir obraz olaraq formalaşması kimi vacib bir prosesə diqqət yetirmək çox vacibdir.

***Açar sözlər:*** *müəllim, tərbiyə, tərbiyəvi iş, şəxsi keyfiyyətlər, təsir mexaizmi*

## The role of teacher personality in the process of education

**Summary**

One of the important methods of education in pedagogy is a model. First of all, it is necessary to talk about the personal model of the tutor. Because famous educators and psychologists have always written about the personal example of the educator and its impact on the formed psychology of children. An educator must have a great reputation among people as a person who directly influences their upbringing, prepares them for life, and instills positive qualities. In this sense, it is very important to pay attention to such an important process as the formation of the teacher as an image.

***Keywords***: *teacher, upbringing, educational work, personal qualities, mechanism of influence*

## Giriş

İnsanın tərbiyəsi olduqca çətin və mürəkkəb bir prosesdir. Pedaqogikanın vacib tərbiyə metodlarından biri də nümunədir. Pedaqogikada bu həm metoddur, həm də tərbiyə vəsitəsidir. Onun vasitəsilə formalaşdırılan keyfiyyətlər uşaqlarda yamsılama, təqlid yolu ilə duyulur və qavranılır.

Elmi pedaqogika nümunənin dörd növünü qeyd edilir:

- Tərbiyəçinin şəxsi nümunəsi
- Ətrafdakıların nümunəsi
- Tarixi nümunələr
- Ədəbi-bədii nümunələr.

İlk olaraq tərbiyəçinin şəxsi nümunəsi haqda danışmaq lazımdır. Münki tərbiyəçinin şəxsi nümunəsinin və onun uşaqların formalaşan psixologiyasına təsiri haqda məhşur pedaqoqlar və psoxoloqlar hər zaman yazmışlar. Bu haqda Bu haqda K.D. Uşinski belə qeyd edirdi: "Tərbiyəçinin cavan ruha təsiri elə bir tərbiyə qüvvəsidir ki, heç bir dərslik, heç bir əlavə nəsihət, heç bir cəza və rəğbətləndirmə onu əvəz edə bilməz" [1, 102]. Təlim prosesində müəllimin rolu çox böyükdür "Yaxşı müəllimi dünyada nə qədər yaxşı sənət sahibi varsa, hamısına bənzətmək olar. Məhz ona görə də bir adamda yaxşı bir keyfiyyət görəndə, adətən "müəlliminə əhsən, mərhaba" deyir, pis olduqda lənətləyirlər. Odur ki, hər müəllim çalışır ki, hər şeydən əvvəl öz şagirdlərinə, tələbələrinə nümunə olsun. Çünki ictimai fikir ondan çox şey umur və həmişə nəzərdə saxlayır" (2, 60).

Tərbiyəçinin hər bir insanın həyatında və cəmiyyətdəki rolunu biz hələ axıra qədər dərk edə bilməmişik. Bu çətin və şərəfli işlə məşğul olan isə tərbiyəçidir yanı müəllim. Tərbiyəçi, bilavasitə öz yetişdirmələrinə təsir göstərən, onları həyata hazırlayan, müsbət keyfiyyətlər aşılayan bir şəxsiyyət olaraq insanlar arasında böyük nüfuza sahib olmalıdır.

Bu mənada müəllimin özünün bir obraz olaraq formalaşması kimi vacib bir prosesə diqqət yetirmək çox vacibdir. Bəs müasir dövr müəllim qarşısında hansı tələbləri irəli sürür?

Müasir tərbiyəçi dedikdə biz, ilk növbədə, yüksək əqidəyə, ideyaya, uşaq dünyasını dərindən bilən, nəzəri və praktik pedaqoji biliklərə malik, vətəndaşlıq mövqeyindən çıxış edən, öz hisslərini uşaqlara təlqin etməyi bacaran bir şəxsiyyəti nəzərdə tuturuq. Bundan başqa tərbiyəçi möhkəm iradəyə, dözümlülüyə, yüksək mədəniyyətə malik olmalıdır. İradəli olmaq, hər bir işdə dözüm göstərmək tərbiyəçiyə çox lazımdır. Özündən tez çıxan, hərəkətlərində və danışığında kobudluğa, qabalığa, təkəbbürlülüyə yol verən, nalayiq sözlər işlədən tərbiyəçi çox tez hörmətdən düşər.

Tərbiyəçi tələbkar olmaqla yanaşı, şagird şəxsiyyətinə hörmət etməlidir. Bunlar olduqca vacib və lazımlı keyfiyyətlərdir. Tərbiyəçi tələbkar olsa da, tərslikdən uzaq olmalı, hər bir şagirddə gələcəyin yetkin bir şəxsiyyətini görməyi bacarmalı, onlarla münasibətini qarşılıqlı hörmət və ehtiram üzərində qurmalıdır.

Vacib keyfiyyətlərdən biri də tərbiyyəçinin təmiz mənəviyyata, nəcib əxlaqi sifətlərə malik olmasıdır. Yəni tərbiyyəçinin təbliğ etdiyi mənəvi keyfiyyətlərinin hamısı (düzlük, vicdan, namus, ədalət, vətənpərvərlik, humanizm və s.) ilk növbədə onun özündə olmalıdır. Çünki, Nahaq yerə deməyiblər ki:- "özündə olmayan şeyi başqasına verə bilməzsən".

Ən əsası isə tərbiyəçi uşaqları sevməlidir və uşaqlar bu sevgini həssaslıqla duyur və ona cavab verməyə can atırlar. Uşaqların məhəbbətini qazanan tərbiyəçi onlarla dostluq etməyi bacarmalı, sevinclərinə və kədərlərinə şərik olmalıdır.

Tərbiyəçi üçün yüksək peşəkarlıq, pedaqoji ustalıq da çox vacibdir. Yaradıcı təfəkkürə, müxtəlif pedaqoji məsələlərin həllinə nail olmaq bacarığı tərbiyəçiyə tərbiyə işini yüksək səviyyədə təşkil etməyə imkan verir. "Tərbiyəçinin bu cür tələblərə cavab verən mövqeyi onun tərbiyəvi fəaliyyətinin əsası olaraq hər bir fərdin azad inkişafına təkan verir və nəsillər arasında əlaqələrin pozulmamasına, zəngin milli irsimizin mənimsənilməsinə xidmət edir" (3, 91).

Tərbiyə işi yaradıcı xarakteri və yüksək gərginliyi ilə seçilir. Tərbiyəçi əməyi şagirdlərin tərbiyəsinin şüurlu, məqsədyönlü aparılmasını tələb edir. Tərbiyəçi öz fəaliyyətində tərbiyənin bütün cəhətlərini aça bilməli, uşaqlarla öz münasibətlərini əməkdaşlıq, humanizm prinsipləri əsasında qurmalıdır. "Müəllim (tərbiyəçi) peşəsi insanşünaslıq olub insanın mürəkkəb mənəvi dünyasına nüfuz etməyə imkan verir". B.A.Suxomlinski

Tərbiyə işini aparmaq üçün ilk növbədə tərbiyə işinin əsas istiqamətlərini düzgün ayırd etmək lazımdır. Bunlar aşakılardır:

1. Düzgün pedaqoji diaqnozun qoyulması.
2. Tərbiyə işinin əsas məqsədini ayırd etmək.
3. Tərbiyə alanların maraqlarını, meyllərini, fərdi, psixoloji xüsusiyyətlərini nəzərə almaq.

Müəllim üçün ən vacib odur ki, tərbiyə alanların müsbət və mənfi keyfiyyətlərini və tərbiyəsində təbiət tərəfindən buraxılmış boşluqlan aşkar etməkdir.

İkinci istiqamət isə aparılan tərbiyə işinin məqsədini müəyyən etmək, bu məqsədin həyata keçirilməsinə, yəni real olmasına inanmaqdır.

Üçüncü istiqamət indiyə kimi aparılan tərbiyə işlərində çox vaxt səhv olaraq nəzərə alınmayan əsas bir şərti qarşıya qoyur, yəni uşaqların maraqlarını, meyllərini, fərdi və psixoloji xüsusiyyətlərinin vacibliyini ortaya qoyur. Bunları bilən tərbiyəçi öz işini real bir zəmində qura bilir və qarşıya qoyulan məqsədə nail olmaq üçün böyük imkanlara malik olur.

Bundan başqa tərbiyəçi öz işinə yaradıcı və səmimi qəlbdən yanaşmalıdır. Təbii ki, müasir dövrümüzün reallıqları tərbiyə işində də öz əksini tapır. Tərbiyəçi Qarşıya çıxan çətinliklərin öhdəsindən gəlməyi bacarmalıdır. Bu, şəxsiyyətindən, öz işinə can yandırmasından, dərin biliyə, saf əxlaqa malik olmasından asılıdır. Tərbiyəçinin bir üstünlüyü də ondan ibarətdir ki, o, yeniyetmələrlə işləyir, həyata onların nəzərləri ilə baxır, arzularına şərik olur, çətin məqamlarda onlara arxalanır.

Milli dəyərlərə arxalanan tərbiyə dövrümüz üçün çox aktual bir məsələdir. Soy kökünə, adət və ənənələrimizə qayıdış tərbiyə işində də çox zəruridir. Tərbiyəçinin bu işdə aparıcı rol oynaması vacibdir. Öz işində xalqımızın mütərəqqi adət və ənənələrindən bacarıqla istifadə edən tərbiyəçi öz

yetişdirmələrinə yüksək əxlaqi keyfiyyətləri aşılaya bilər, onların xalqa, vətənə layiq bir övlad kimi yetişməsində müstəsna rol oynayar.

Tərbiyəçi tərəfindən istifadə olunan metodlar da tərbiyə işinin effektini artırır, uşaqların təfəkkürün formalaşmasına xidmət edir. Müasir tərbiyə sisteminin əsasını xeyirxahlıq, nəvaziş, saflıq kimi dəyərlər təşkil edir. Tərbiyəçinin işində bu keyfiyyətlərin aşılanması azad, fəal, özünə və başqalarına hörmət edən bir şəxsiyyətin tərbiyəsi üçün olduqca vacibdir. “Cəmiyyətin yeni iqtisadi "relslər" üzərində irəliləməsi, demokratiyanın "şəksiz-şübhəsiz" qəbul olunması tərbiyəçi qarşısında da yeni tələblər qoyur. Bu tələblərin mahiyyəti tərbiyənin məqsədi ilə üst-üstə düşməlidir ki, apanlan tərbiyəvi işlər öz təsir qüvvəsini itirməsin və arzu olunan nəticələr əldə edilsin. Bunun üçün nəyi isə icad etmək lazım deyil. Sadəcə olaraq, xalqın maddi və sosial rifahının yaxşılaşdırılması ön plana çəkilməli, istifadə olunan tərbiyə metodlarının və formalarının humanist məcraya yönəldilməsi, tərbiyənin şəxsiyyətə üz çevirməsi lazımdır” (3, 89)

Bu keyfiyyətlərə malik tərbiyəçinin formalaşması üçün illərin təcrübəsi, uşaqlarla səmimi və açıq münasibətlərin qurulması, onların maraqlarma həssaslıqla yanaşılması, qabiliyyətlərinin inkişafı üçün münbit zəmin yaradılması, öz yetişdirmələrinin qeyri-standart düşüncələrinin olduğu kimi qəbul edilməsi bacarığı və onlarda yaradıcı fəaliyyətin əsasının qoyulması kimi şərtlər tələb olunur.

Xalqın gələcəyi müəllimin tərbiyəvi işindən asılıdır. Bu mənada müasir tərbiyəçiyə verilən tələblər olduqca mühüm şərtlərdir. Yüksək mənəvi keyfiyyətlərə, saf əqidəyə, vətəndaşlıq hisslərinə malik olan tərbiyəçi üçün qoyulan tələblər o qədər də çətin və yerinə yetirilməsi mümkün olmayan deyildir. Bütün bu işlərdə tərbiyəçi təkbaşına deyil, ailənin, ictimaiyyətin, əmək kollektivlərinin köməyinə arxalanmalı, onlarla əlbir işləyərək qarşıya qoyulan məqsədə çatmalıdır.

Pedaqogikanın əsas məqsədi hərtərəfli və harmonik inkişaf etmiş insanlar tərbiyə etməkdir. Tərbiyənin bu məqsədinə nail olmaq üçün insanlar əsrlər boyu çalışmış, çalışır və çalışacaqlar. Tərbiyəçinin şəxsi nümunəsindən başqa digər bir vacib tsir mexanizmi var. Bu *nəzarət mexanizmidir*.

Tərbiyə işində nəzarət daha çox müşahidə formasında həyata keçirilir. Nəzarət formasında aparılan müşahidə müəllim, valideyn, sinif rəhbəri, tədris mütəxəssisinin rəhbərləri, digər tərbiyəçilər tərəfindən həyata keçirilir. Tərbiyə işində istənilən nəticəni əldə etmək üçün nəzarət üsulundan istifadə etmək lazımdır. Tərbiyəçi müşahidə faktları əsasında lazım gəldikdə işə qarışa bilir, müəyyən düzəlişllər edir və s. Tərbiyəçi tərəfindən nəzarətin olduğunu bilən şəxsin (şagirdin və ya tələbənin) məsuliyyəti xeyli artır, o, daha yaxşı işləməyə səy göstərir. Nəzarət üsulundan bütün tərbiyəvi tədbirlərdə: müzakirələrdə, disputlarda, gəzintilərdə, şəhidlər xiyabanına ziyarətdə, döyüşçülərlə görüşlərdə, kino və ya teatra kollektiv baxışda, məktəbdə tənəffüz zamanı, məşğələdə, ailədə və sair yerlərdə istifadə etmək olur.

Tərbiyə prosesinin son mərhələsində istifadə olunan üsullardan biri də davranış və fəaliyyət nəticələrinin yoxlanılmasıdır. Tərbiyə işində yoxlamanın məqsədi şagirdlərin tərbiyyəlilik səviyyəsini üzə çıxartmaq, tərbiyyəçinin fəaliyyətinin səmərəlilik dərəcəsini öyrənmək, tədris müəssisəsinin işini səciyyələndirmək və s. məqamlardır. Davranış və fəaliyyət nəticələrinin yoxlamaq üçün şagirdlərə müxtəlif məzmunlu və formal ictimai-faydalı tapşırıqlar verilir. Məsələn, divar qəzeti çıxartmaq; qəzetə məqalə yazmaq; yaxud şəkil çəkmək; tənha qocalara baş çəkmək; sinif otağında çiçəklərə qulluq etmək; tənəffüz zamanı növbətçilik etmək, üzlüyü aralanmış kitabları sahmana salmaq; xəstə yoldaşa köməklik göstərmək; məktəbyanı sahəni daş-kəsəkdən təmizləmək və s. və i.a. Nəzarətin və yoxlamanın nəticələri qiymətləndirilir.

Pedaqogikada giymətləndirmə üsulları da istifadə edilir. Bu üsulları iki böyük qrupa ayırmaq olar: rəğbətləndirmə üsulları və tənbeh üsulları. Hər iki üsulun siyasi, psixoloji və pedaqoji mənaları vardır. Siyasi mənası: qiymətləndirmə üsulu ilə nəyin cəmiyyətdə bəyənildiyini, nəyin isə bəyinilmədiyini tərbiyə olununların nəzərinə çatdırmaqdan ibarətdir. Psixoloji mənası budur ki, yaxşı sözünə və yaxşı davranışına görə rəğbətləndirilən şəxs sevinc hissi, məmnunluq hissi keçirir: nalayiq sözünə, ədalətsiz hərəkərinə görə tənbeh edilən şəxs isə peşimançılıq hissi keçirir, kədərlənir. Xoş sözünə, davranışına və ya fəaliyyətinə görə rəğbətləndirilən şəxs bundan sonra da nümunəvi əmədləri ilə sevinc hissləri keçirməyə çalışır; ətrafdakılar tərəfindən bəyənilməyən şəxs isə birdaha peşmançılıq hissləri keçirməmək üçün çalışır ki, yaramaz hərəkətlərinə yol verməsin.

Tərbiyə olunanların fəaliyyətlərini, onların fəaliyyətindəki fərdi xüsusiyyətlərə laqeyidlik göstərmək, münasibət bildirməmək, qiymətləndirməmək yolverilməzdir.

"Rəğbətləndirmə üsulları - Pedaqogika elm kimi formlaşana qədər xalq arasında tərbiyə məqsədi ilə rəğbətləndirmə üsullarından istifadə olunmuşdur: yaxşı əməllərinə görə uşaqları tərifləmişlər, belələrinə hədiyyələr vermişlər. Ehtiyacı olanlara, yetim uşaqlara həyan duranlar, çətin vəziyyətə düşənləri xilas edənlər, igidlik nümunəsi göstərənlər nağıllarda, dastanlarda, rəvayətlərdə tərənnüm olunmuşdur "Əl tutma Əlidən qalıb" deyirlər." (4, 288)

Tədris müəssisələrində, idarədə, ailədə və digər ictimai yerlərdə iki qrup rəğbətləndirmə üsulları tətbiq olunur. Bunlar sadə rəğbətləndirmə üsulları və yüksək rəğbətləndirmə üsullarıdır. Sadə rəğbətləndirmə üsulları arasında uşağın saçına sığal çəkmək, "*Afərin!", "Sağ ol!", "Qoçaq qızım!", "Qoçaq oğlum!", "İşi belə görərlər!"* kimi qəlbə qida verən ifadələr işlətmək, arzusunu yetirmək (konsertə, sirkə, sərgiyə, kinoya, teatra, muzeyə və s. görməli yerlərə aparmaq); kitab alıb hədiyyə vermək, yaxşı yazısını, nitqini, davranışını, səyini dilə gətirib tərifləmək və s. qeyd edir. Yüksək rəöbətləndirmə üsulları arasında isə şifahi və ya yazılı təşəkkür elan etmək; adlı təqaüdə təqdim etmək; turizm gəzintisi üçün putyovka vermək; adına tərifnamə yazmaq; gümüş və ya qızıl medalla təltif etmək; fərqlənmə diplomu vermək; magistratura ya aspiranturaya təqdim etmək; xaricə oxumağa göndərmək; şəklini şərəf lövhəsinə vurmaq; kütləvi yığıncaqlarda adını çəkmək; haqqında qəzetə məqalə yazmaq və s. qeyd edir.

Bundan başqa elmi pedaqogikada *tənbeh üsulları* da xüsusi qeyd olunur. Bu üsullar tarixən cəza üsulları adlandırılmış indi də belə adlanır. Lakin respublikamız dövlət müstəqilliyi qazandıqdan sonra tərbiyədə cəza əvəzinə tənbeh sözünün işlədilməsi daha uyğundur. Çünki, tənbeh tərbiyə işində fiziki cəza üsullarını, habelə insan şəxsiyyətini alçaldan digər üsulları istisna edir. Öz növbəsində tənbeh üsulları da iki qrupa bölünür: yüngül tənbeh və nisbətən ağır tənbeh üsulları.

Yüngül tənbeh üsulları: tərbiyəçinin simasında narazılıq əlamətlərinin təzahürü: *"Belə olmaz!", "Belə yaramaz!", "Razı deyiləm", "Narazı qaldım"* kimi ifadələrin işlədilməsi; diqqəti yayınan şagirdə yanaşmaq; səsin tonunu qaldırmaq və ya əksinə, endirmək; uşağın və ya şagirdin istəyinə əməl etməmək və s. Ağır tənbeh üsulları: bir müddət danışıqdırmamaq; məzəmmət etmək, danlamaq; şifahi töhmət elan etmək; yazılı töhmət elan etmək; təkrar sinifdə (kursda) saxlamaq; adlı təqaüddən məhrum etmək; ictimai tapşırığı başqasına həvalə etmək; başqa tədris müəssisəsinə köçmək; tədris müəssisəsindən xaric etmək və s.

Elmi ədəbiyyatda rəğbətləndirmə və tənbeh üsullarının tətbiqinə aşağıdakı tələblər verilir.

1. Rəğbətləndirmə və ya tənbeh obyektiv olmalı və qısa da olsa səciyyələndirilməlidir.
2. Rəğbətləndirmə və ya tənbehin konkret halına biryolluq verilmiş qiymət kimi baxılmalıdır. Şəxs bilməlidir ki, bu gün rəğbətlətdirilən sabah tənbeh oluna və ya əksinə, tənbeh olunan sabah rəğbətləndirilə bilər.
3. Günahını etiraf edən şəxsin bağışlanmaq imkanı nəzərə alınmalıdır.
4. Azərbaycanda tarixən olduğu kimi, indinin özündə də mütərəqqi fikirli şəxslər təlim və tərbiyə zamanı fiziki cəzanın yolverilməz olduğunu söyləmişlər; bunu daim yadda saxlamaq lazımdır.

Müəllim hər zaman humanizm prinsipinə əsaslanmalıdır. Unutmamalıdır ki, gələcək nəslin, müasir insanın bir şəxsiyyət kimi formalaşması müəllimdən asılıdır. Elə "pedaqogika" sözünün mənşəyi ("payda" və 'jqoqos") də humanizmdən qaynaqlanır: "uşaq ötürən", "uşaq himayə edən". Doğrudan da işlədiyin bir müəssisədə xırda səhvə görə işini itirə bilərsən və s. Amma məktəbdə hamı xoş ünsiyyətlə, qayğı ilə əhatə olunursan, müəllimlərin dəstəyi ilə elmin sirlərinə yiyələnirsən, əxlaqi-mənəvi cəhətdən pillə-pillə ucalırsan. Nailiyyətlərinlə yanaşı, uğursuzluqların da olur.

Məqalə şərçivəsində müəllimin tərbiyəvi fəaliyyətə hazırlanması haqda məsələlərə də toxunmaq istərdik. Burada iki məqamı ayırmaq istərdik: 1) tərbiyəvi fəaliyyətə hazırlanma; 2) şəxsiyyət kimi formalaşdırma. "Tərbiyəvi fəaliyətə hazırlanma dedikdə, müəllimin bu fəaliyyətə başlamağa hazır olması və psixi proseslərin baş verdiyi şərait nəzərdə tutulur. Bu yanaşmada hazırlanmanın müəllimin daxilən bu prosesə hazır olma hissi ilə şərtləndiyi nəzərə çarpır. Hazır olma hissi isə tələbatlar və motivlərin əsasında tərbiyəvi fəaliyyətdə məqsədin müəyyənləşdirilməsindən başlayır". (6, 15)

D.N. Uznadze hazır olmanı fəaliyyətə ruhlandırılma kimi izah etmişdir. O, bu anlayışı kiçik psixoloji fenomen kimi deyil, subyektin bütövlükdə vəziyyəti kimi başa düşüldüyünü qeyd edirdi. Bu, o deməkdir ki, fəaliyyətə ruhlandırma obyektiv şəraitin təsirindən əmələ gələn psixoloji fəallıq yaradır və onu yaradan obyektiv şəraitin əks olunduğu vəziyyəti təqdim edir. Burdan belə bir nəticəyə gəlmək olar ki, fəaliyyətə ruhlandırılma sırf subyektiv hal olmayıb, obyektiv hadisələrin subyektə təsiri nəticəsində yaranır. (8, 66).

V. N. Myasişevin fikrincə, insanın fəaliyyətə hazır olması, onun bu işə müsbət münasibətindən başlayır. Fəaliyyət zamanı münasibət, eləcə də fəaliyyətə ruhlandırılma üçün şəxsiyyətə daxili qüvvələrini səfərbər etməsi xarakterikdir (9).

## Nəticə

Fəaliyyətə hazır olma hissi təlabatlar və motivlərin əsasında məqsədin müəyyənləşdirilməsindən, yaxud insanın qarşısında duran vəzifələri dərk etməsindən başlayır. Bundan sonra insan qarşıdakı fəaliyyət üçün plan, sxem və s. hazırlayır, ayrı-ayrı hissələrin hazırlığı ilə məşğul olur. Ümumiyyətlə, fəaliyyətə hazır olmada, onun təşkili və qorunub saxlanılmasında şəxsiyyətin keyfiyyətləri həlledici rol oynayır.

İnsanın hər hansı bir işə hazırlanmasının səmərəliliyi onun bu işə hazır olma səviyyəsindən, bir şəxsiyyət kimi möhkəm xarakterli olmasından çox asılıdır. Əgər möhkəm xarakter və fəaliyyətə hazır olma motivləri varsa, hazırlanma prosesini təşkil etmək asanlaşır. Bu halda hazırlanma uğurlu fəaliyyətin ilkin şərti kimi uzunmüddətli və müəyyən struktura: peşə fəaliyyətinə, eyni zamanda tərbiyəvi fəaliyyətə müsbət münasibətə, peşə fəaliyyətinin tələblərinə uyğun şəxsi keyfiyyətlərə, pedaqoji qabiliyyətlərə, fəaliyyətə hazır olma motivlərinə, eləcə də, vacib bilik, bacarıq və vərdişlərə malik olur.

## References


1. V.A.Sukhomlinski. I give my heart to children. Baku, Maarif, 1979
2. N.Mirza. Pedagogical thoughts. Textbook. Baku, Translator, 2020, 216 p.
3. V.H.Jumshudov. Methodology of educational work. Baku, Book World, 2006. 104p.
4. N.Kazimov. School pedagogy. Baku, 2009, 438 p.
5. F.Rustamov. Humanist pedagogy or humanism in pedagogy? Baku, Science and education,
6. Sh.Mammadov. Pedagogical bases of preparation of primary school teacher for educational activity
7. M.Ilyasov. Modern problems of teacher professionalism and pedagogical competence. Baku, 2018, 208 p.
8. D. Uznadze. Psychology of installations. Minsk, 2001, 416 p.
9. B. Myasishchev. Personality and neurosis. L .: 1960, 161 p.
10. N. Tusi. Moral-Nasiri. "Science", 1980, p. 157.
11. https://fayllar.org/terbiyenin-prinsipleri-ve-terbiyenin-usullari.html
12. http://minber.az/mu%C9%99llim-kimdir


**Rəyçi: dos. Ş.Ağakişiyeva**

Göndərilib: 01.12.2021 Qəbul edilib: 21.12.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/73/58-63

**Amalya Arif qızı Rzayeva**
Azərbaycan Dövlət Aqrar Universiteti
assistent
amalya_rzayeva@mail.ru

# AQRAR SAHƏDƏ İNNOVASİYA YÖNÜMLÜ İNVESTİSİYALARIN NƏZƏRİ ASPEKTLƏRİ VƏ ONLARIN MALİYYƏLƏŞDİRMƏ MƏNBƏLƏRİ

**Xülasə**

Müasir şəraitdə aqrar sahənin inkişafı sahəyə innovasiya yönümlü investisyaların yatırılması olmadan mümkün deyil. Innovasiyalar bazar iqtisadiyyatı şəraitində istehsalın inkişafını və səmərəliliyini artmasını təmin edən amillər sistemində başlıca yer tutur. Aqrar sahədə innovasiya proseslərinin öz spesifikası var. Onlar regional, sahə, funksional, rexnoloji və təşkilatı xüsusiyyətlərinin müxtəlifliyi ilə frqlənirlər. Aqrar sahədə innovasiyalarla bağlı bütün məsələlər bu xüsusiyyətləri nəzərə alaraq həyata keçirilməlidir. O cümlədən aqrar sahədə innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsi məsələlərinin həllidə. Aqrar sahədə innovasiya sisteminin formalaşdırılması və inkişaf etdirilməsi ona istiqamətlənir ki, istehsalı yeni texnoloji qurluşa keçirməyə və aqrar məhsulların daxili və xarici bazarlarda rəqabət qabiliyyətini təmin etməyə imkan verən yeniliklər yaradılsın və mənmsənilsin. məqalədə aqrar sahədə innovasiya yönümlü investisiyaların nəzəri aspektləri öyrənilmiş və onların maliyyələşdirmə mənbələri araşdırılmışdır**.**

***Açar sözlər:*** *aqrar sahə, innovasiya, maliyyə, investisiya, maliyyə mənbələri, büdcə vəsaitləri, bank kreditləri, vençur kapitalı, risk*

## Theoretical aspects of innovation-oriented investments in agriculture and their sources of funding

**Summary**

In modern conditions, the development of the agricultural sector in the field of innovation is imposible. Innovation play a key role in the system of factors that ensure th edevelopment and increase of efficiency of production in a market economy. Innovation processes in the agricultural sector have their own specifics. They differ in regional, functional, technological and organizational features. All issues related to innovations in the agricultural sector should be implemented taking into account these features. In particular, in solving the issues of financing innovation-oriented investments in the field. The formation and development of the innovation system in th eagricultural sector is aimed at creating and mastering innovations that allow to transfer production to a new technological structure and ensure the competitiveness of agricultural products in domestic and foreign markets.

***Key words:*** *agrarian area, innovation, finace, investment, sources of funding, budget funds, bank loans, venture capital, risk*

## Giriş

Aqrar sahədə daxili yığımların azalması ilə müşayət edilən innovasiya fəaliyyətinin zəifləməsi aqrar sahənin vəziyətini daha da çətinləşdirdi, innovasiyaların maliyələşdirilməsində yeni mənbələrin axtarılması və əsaslandırılmasını zəruri etdi. Bununla bağlı aqrar sahədə innovasiya fəaliyyətinin özəl kapitallın iştirakı ilə formalaşdırılması və inkişaf etdirilməsi istiqamətlərinin tədqiqi xüsusi aktuallıq kəsb etməyə başlamışdır. Müasir zamanda bu problem həm praktiki həm də elmi baxımdan xüsusiylə əhəmiyyətlidir.

Innovasiya fəaliyyəti iqtisadiyyatın müxtəlif sektorlarında iqtisadi artımın ən vacib amillərindən biridir. Innovasiya proseslərinin müvəffəqiyyətlə həyata keçməsi üçün həm dövlətdən, həm də özəl sektordan maddi, həm maliyyə, həm məlumat, həm insan, həm də digər resursların səfərbər edilməsi tələb olunur. Əgər investisiyalar, ixtisaslı kadrlar və dövlət dəstəyi olmasa heç bir elmi və təcrübə konstruktor işləmələri həyata yol aça bilməz.

Investisiya və innovasiya fəaliyyətinin qarşılıqlı əlaqəsinin bir neçə aspekti var. Onlardan ən vaibi investisiyalara elmi tədqiqatların özünəməxsus katalizatoru kimi baxılmasıdır. Bu elmin cəmiyyətin

bilavasitə istehsal qüvvəsinə çevrildiyi bir şəraitdə xüsusən də vacibdir. Hal hazırda investisiyalar innovasiya prosesinə bütün təsərrüfat fəaliyyətlərində yatırılır: həmisthsalata, həm tikintiyə, həm də sosial infrastruktura. Bizim məqalədə aqrar sahədə innovasiya yönümlü investisiyalara və onların maliyyə mənbələrinə baxılıb.

## Materiallar və müzakirələr

Aqrar sahədə innovasiya proseslərinin öz spesifikası var. onlar regional, sahə, funksional, rexnoloji və təşkilatı xüsusiyyətlərinin müxtəlifliyi ilə frqlənirlər. Bu xüsusiyyətlərdən biri ondn ibarətdir ki, aqrar sahədə sənaye mənşəli istehsal vəsaitləri ilə yanaşı istehsal prosesində canlı orqanizmlər də, bitki və heyvanlar, fəal iştirak edirlər. Geniş təkrar isthsal iqtisadi və təbii bioloji proseslərin qarşılıqlı əlaqəsi və təsiri altında baş verir. Ona görə də innovasiyaların işlənib hazırlanmasında və həyata keçirilməsində tək iqtisadi qanunların tələblərini deyil həm də təbiət qanunlarının – bərabər əhəmiyyətlilik, həyat amillərinin əvəzolunmazlığı və məmusu, minimum, optimum və maksimum qanunları – nəzərə alınmalıdır. Amillərin əvəzolunmazlığı qanununun təsiri məsələn, seleksiyanın kübrələri əvəz etməməyində, sortla aqrotexnikada olan çatışmamazlıqları, cinsi işlə yemi əvəz etmək mümkün olmamasında özünü göstərir. Bununla bağlı biz məqalədə "investisiya" və "innovasiya" anlayışlarını təhlil etmişik.

Beləliklə müasir elmi-texniki tərəqqini innovasiya fəaliyyəti nəticəsində əldə edilən intelektual məhsulsuz təsəvvür etmək belə olmaz.

Novation sözü dəyişiklik, yenilənmə mənasını verir, bu elə bir yenilikdir ki, əvvəllər heç ilmamaışdır: yeni fenomen, ixtira, ictimai tələbatların ödənilməsinin yeni üsulu və s. innovadiya yeni texnika və ya texnologiyaya, əməyin təşkilinin yeni formlarına, xidmət sahəsinə, idarəetməyə və s. edilən kapital qoyuluşundan əldə olunan maddiləşmiş nəticədir. innovasiyaların yaradılması, mənimsənilməsi və yayılması isə innovasiya prosesi adlanır. innovasiya ddikdə yeni prosesin, məhsulun və ya xidmətin təcrübədə mənimsənilməsi kimi innovasiyalara yatırılan investisiyalar başa düşülür (İvanov V.A. 2008. səh. 25).

Investisiya termini bazar iqtisadiyyatı şəraitində daha geniş istifadə olunur. Maliyə baxımından investisiya gəlir (fayda) əldə etmək məqsədiylə təsərrüfat fəaliyyətinə yatırılan aktivlərin (vəsaitlərin) bütün növləridir. Iqtisadi baxımdan isə investisiya əsas və dövriyyə vəsaitlərinin yaradılması, genişləndirilməsi və rekonstruksiyasına çəkilən xərclərdir. İnvestisiya mənfəət əldə etmək və (və ya) faydalı səmərəyə nail olmaq üçün sahibkarlıq və (və ya) digər fəaliyyət obyektlərinə qoyulan pul vəsaitləri, qiymətli kağızlar, o cümlədən pulla qiymətləndirilən əmlak hüquqlarıdır. (İqonina L.L. 2002, səh.22-25).

Innovasiya təkrar istehsalın tipini, sosial-iqtisadi münasibətlərin keyfiyyətini dəyişən bir proses kimi milli sərvətin özünəməxsus forması, yığım meyarları və strukturu olan, innovasiya yönümlü iqtisadiyyat yaradır.

Y.Şumpeter "Texniki inkişaf nəzəriyyəsində" innovasiyaya texniki dəyişikliyin iqtisadi təsiri kimi baxırdı. nəticədə yenilik və ixtira arasında əlaqələndirici olan yeni insan – sahibkar – əmələ gəlir. Innovasiyaların təhlili göstrir ki, onlar sosial-iqtisadi xarakterli funksiyalar yerinə yetirirlər. Innovasiyalar bütövlükdə təkrar istehsala və stimullaşdırmaya zəmin yaradırlar. Təkrar istehsal funksiyası göstərir ki, innovasiya maliyyələşdirmənin vacib mənbəyi qismində çıxış edir. Innovasiyalardan əldə olunan pul gəlirləri maliyyə resurslarının mənbəyi qismində çıxış edən, eyni zamanda innovasiya prosesinin səmərəliliyini müəyyən edən sahibkar mənfəətini yaradır. Dövlətin sosial-iqtisadi siyasətinin tərkib hissəsi olan innovasiya siyasəti innovasiya fəaliyyətinin inkişafına və stimullaşdırılmasına istiqamətlənir və texniki tərəqqi əsasında yeni və ya təkmilləşdirilmiş məhsulun yaradılması ilə xarakterizə olunur. Kanadada innovasiyaların stimullaşdırılmasının birbaşa aləti qismində dövlət qrantlarından və ya investisiya prosesinin birbaşa maliyyələşdirilməsindən istifadə edilir. Yaponiyada özəl firmalarla birgə innovasiyaların yaradılmasını həyata keçirən dövlət korporasiyaları və mərkəzləri büdcədən subsidiyalaşdırılır. Almaniyada yüksək qeyri-müəyyənlik dərəcəsi ilə xarakterizə olunan önəmli elmi istiqamətlər üzrə uzunmüddətli tədqiqatların birbaşa maliyyələşdirilməsi həyta keçirilir.

Beləliklə beynəlxalq standartlara uyğun olaraq innovasiya innovasiya fəaliyyətinin bazara tədbiq edilmiş yeni və ya təkmilləşdirilmiş məhsulu, praktiki fəaliyyətdə istifadə olunan yeni və ya

təkmilləşdirilmiş texnoloji proses şəklində və ya sosial xidmətlərə yeni yanaşmada ifadə olunmuş nəticəsi kimi müəyyənləşdirilir. Bu isə son nəticə o zaman olur ki, ona vəsait yatırılmış olsun, yəni investisiya.

Aqrar istehsalın mürəkkəbliyi və onun səciyyəvi xüsusiyyətləri innovasiya fəaliyyətinə yanaşmaların özünəməxsusluğunu, müxtəlif tipli innovasiyaların uzlaşdırılmasını, innovasiyaların stimullaşdırılmasında dövlətin rolunun gücləndirilməsini müəyyən edir. (Truşin Y. 2006, Truşin Y., 2007c-67/)

Qeyd etmək lazımdır ki, aqrar istehsalın xüsusiyələri innovasiya proseslərinin risklərinin yüksək səviyyədə olması iləxarakterizə olunur. Elm-istehsal nəticələrinin maliyyələşdirilməsi riski, Bu risklərə innovasiyaların maliyyələşdirilməsi riski, innovasiyalara çəkilən xərclər və onun nəticələri arasında böyük zaman kəsiyinin olması riski, innovativ məhsula tələbin qeyri-müəyyənliyi riski özəl investorları bu sahənin inkişafına kapital qoyuluşları etməyə maraqlarını artırmır (Mamontov V.D., Kojevnikov T.M. 2012. № 1).

Aqrar sahədə innovasiyaların dörd əsas istiqamətini seçmək olar:

- seleksiya-genetika sahəsində,
- istehsal-texnoloji sahədə,
- təşkil-idarəetmə sahəsində,
- iqtisadi-sosial-ekoloji (İvanov V.A. 2008. səh.77).

Aqrar sahədə innovasiya fəliyyəinin iqtisadi mexanizminə aşağıdakılar daxildir:

– innovasiyaların strateji idarəetməsi. Bura ETTKİ potensialından, müəssisələrin istehsal potensialından, daxili vəxarici amillərin, istehlakçıların yeniliklərə olan tələbatından irəli gələrək tədbirlərin, proqramların, layihələrin işlənib hazırlanması aiddir;

– innovaiyaların planlaşdırılması. Bura alətlər dəsti, qaydalar, məlumat və son nəticəyə nail olmağa hədəflənmiş proseslər aidir;

– innovasiya yönümlü sahibkarlıq fəaliyyətinin dəstəklənməsi və stimullaşdırılması;

– innovasiya proseslərinin maliyyələşdirilməsi sistemi. Bura maliyə resurslarının mənbələri, toplanmış vəsaitlərin yatırılması prinsipləri, investisiyalardan istifadəyə nəzarət mexanizmi, onların geri qayıtması imkanı və innovasiya yönümlü investisiya layihələrinin qiymətləndirilməsi;

– yenilikləri yaradan və mənimsəyən təşkilatların vergiyə cəlb edilməsi, innovasiya risklərinin sığortalanması;

– təsərrüfatçılıq subyektinin rəqabət qabiliyyətinin və yeni bazarların mənimsəməsinin dəstəklənməsinə istiqamətlənən strateji və taktiki innovasiya marketinqi;

– innovasiya məhsuluna qiymətqoyma.

Innovasiya yönümlü investisiyya qoyuluşlarına təsir edən amillər obyektiv və subyektiv ola bilər. Obyektiv faktorlara xammal resursları ilə təmin olunma, iqlim şəraiti və s. aiddir. Aqrar sahənin inkişafına obyektiv amillər təsir göstərir: istehsalın mövsümiliyi, istehsal dövrünün uzun olması, ivestisiyaların yavaş dövretnməsi, məhsulun kapitaltutumlu olması və s. Subyektiv amillərə sosial-iqtisadi, sosial-siyasi və hüquqi rejim aiddir. obyektiv və subyektiv amillər aqrar sahədə innovasiya yönümlü investisiya fəaliyyətinin inkişafına təsir edir, onların optimal uyğunlaşdırılması aqrar sahədə fəaliyyət göstərən təşkilatlara səmərəli fəaliyyət göstərməyə imkan verir.

Göstərilən amillərin təsiri altında innovasiya-investisiya mühiti yaranır. İnvestisiyalara münasibətdə innovasiya-investisiya mühiti əlverişli və qeyri-əlverişli ola bilər. Əlverişli innovasiya-investisiya mühiti investorların aktiv fəaliyyətinə zəmin yaradır və kapitalın axıb gəlməsini stimullaşdırır. Qeyri-əlverişli mühit innovasiya-investisiya risklərini yüksəldir, kapitalın axıb getməsinə və innovasiya yönümlü investisiyalarının zəifləməsinə gətirib çıxarır

innovasiyalara yönəldilən investisiyaların aşağıdakı xüsusiyyətlərini göstərmək olar:

1. Investisiyalar həm gəlirlilik səviyyəsinə, həm də risk dərəcəsinə götə fərqlənən müxtəlif innovasiyalara yönəldilə bilər. Ona görə də investisiyalar portfelinin bu meyarlar üzrə optimallaşdırılmasına ehtiyac yaranır.

2. Investisiya-innovasiya fəaliyyətinin nəticələrinə həm riskin səviyəsinə təsir dərəcəsinə, həm də qeyri-müəyyənliyinə görə bir birindən fərqlənən müxtəlif amillər təsir göstərir.

3. Investisiya layihəsinin həyat tsikli kifayət qədər uzun ola bilər və bir neçə il çəkər və bu şəraitdə bütün mümkün olan amilləri, onların layihənin gəlirliliyinə və riskin ölçüsünə təsirini nəzərə almaq çətin olar.

4. Çox vaxt investisiya və innovasiya risklərinin müəyyən edilməsi üçün əvvəlki dövrlərə aid samballı statistik məlumat olmur ki, onun əsasında oxşar investisiya layihəsini reallaşdıran zaman proqnozlar verilsin /Syomina L.A., 2012)

Tam nəticəli innovasiyanı həyata keçirmək üçün innovasiya yönümlü invstisiyaların maliyyələşdirilməsi lazımdır. Innovativ iqtisadiyyatın inkişaf etdirilməsi üçü elmi tədqiqatların və işləmələrin dövlət tərəfindən maliyyələşdirilməsi, xırda innovativ müəsisələrin dəstəklənməsi, vençur maliyyələşdirməsinin inkişaf etdrilməsi və qanunvericilik bazasının yaxşılaşdırılması lazımdır. Maliyyələşdirmənin həcminin limitləşdirilməsi alimlərə imkan vermir ki öz işləmələrini tədbiq və sonuncu satış mərhələsinə çatdırsınlar.

Azərbaycanda innovativ işləmələr təqdim edən marketinq üzrə ixtisaslaşmış təşkilatlar azdır. Eyni zamanda tədqiqatçı kollektivlərə onlar barədə demək olar ki, heç bir şey məlum deyil, və ya onların xidmətləri çox bahadır.

İnnovasiya yönümlü investisiyaların maliyyələşdirilməsinin bir neçə mənbəyi seçilir: şəxsi vəsaitlər, cəlb edilmiş vəsaitlər və borc vəsaitləri.

Innovasiya şirkətlərinin şəxsi vəsaitlərinə mənfəətin yenidən investisiya edilən hissəsi, amortizasiya ayırmaları, ziyanın ödənilməsi üçün sığorta məbləği, aktivlərin satışından əldə olunan gəlir və s.aiddir. bu maliyyələşdirmə mənbəyi ən geniş yayılmış mənbədir. Lakin qeyd etmək lazımdır ki, bu vaxt maraqların münaqişəsi yaranır. səhm sahibləri tədqiqatlara investisiya qoymaq yox dividend almaq istəyirlər.

Cəlb edilmiş vəsaitlərə səhm və digər qiymətli kağızların emissisyasından əldə edilən vəsaitlər və əvəzsiz əsaslarla təqdim edilən vəsaitlər aiddir. Qiymətli kağızların investisiyası maliyyə resurslarını əlçatan edir, lakin sonradan dividend vermək lazım gəlir və səhmləri uğurla yerləşdirmək üçün şirkətin maliyyə göstəriciləri yaxşı olmalıdır.

Borc vəsaitlərinə bank kreditləri, kommersiya krditləri və büdcə kreditləri aiddir.

Azərbaycanda innovasiya yönümlü layihələrin maliyyələşdirilməsi mənbələri aşağıdakı cədvəldə verilmişdir.

**Cədvəl**

2020-ci ildə tədqiat və işləmələrə çəkilən daxili xərclərin mənbələr üzrə bölgüsü

| Mənbələr | 2020 | Xüsusi çəkisi |
|---|---|---|
| Cəmi | 162 452,5 | 100 |
| o cümlədən maliyyə mənbələri üzrə: | | |
| büdcə vəsaiti | 122 735,5 | 76 |
| büdcədən kənar vəsait | 1 271,2 | 1 |
| öz vəsaiti | 9 436,2 | 6 |
| sifarişçinin vəsaiti | 29 009,6 | 17 |

Mənbə https://www.stat.gov.az/source/education/

Ölkədə innovasiyalara çəkilən xərclərin 76% büdcə vəsaitləri hesabına maliyyələşdirilir. Xərclərin cəmi 1% büdcədən kənar vəsaitlər hesaına, 6% innovasiya şirkətlərinin öz vəsaitləri və 17% sifarişçinin vəsaitləri hesabına maliyyələşdirilir.

Bizim ölkədə innovasiya layihələrinə kredit verməyin müəyyən çətinlikləri var. kredit verən bank üçün bu yüksək risklə bağlıdır, ona görə də banklar bu cür maliyyələşdirməyə həvəssiz razılaşırlar. Bununla bağlı layihənin texniki-iqtisadi əsaslandırılması və nümayişin hazırlanması lazımdır. Innovasiya yönümlü investisiya layihələri digərlərindən fərqli olaraq daha çox elmi tədqiqatlar və təcrübə konstruktor işləri ilə bağlıdır. Onların nəticələri isə yüksək risklə bağlı olduğundan uğurla başa çatdırılarsa daha çox mənfəət verə bilər. belə layihələrin nümayiş etdirilməsi müəyyən təcrübə tələb edir. Inverstorlar isə, xüsusən də bank təşkilatları, yeni texnologiyalar barədə kifayət qədər biliklərə malik olmurlar və bu məlumatı qavramaq uçun zəif hazırlıqlı olurlar. Bu isə başqalarından fərqli olaraq

nümayişlərin istifadəsinin kreditin alınması ehtimalını daha da aşağı salır (Xomkina K.A., 2010. səh.120)

Maddi aktivlər şəklində zəmanət olmasa banklar adətən kredit verməkdən imtina dirlər. bundan başqa innovasiya fəaliyyəti ilkin mərhələlərdə daha yüksək riskli olduğundan kreditləşmə də şirkəın üçün əlverişli olmayan daha yüksək dərəcəylə həyata keçirilir.

Aqrar sahədə innovasiya yönümlü investisiyaların bu şərti vençur maliyyələşdirməsinin və özəl investisiyaların inkişafına zəmib yaradır. Vençur biznesinin inkişaf etdirilməsində, onun üçün əlverişli iqtisadi sistemin yaradılmasında dövlətin rolu böyükdür. Bu zaman dövlətin özü də faydalanır çünki, qabaqçıl elmi-texniki işləmələr mənimsənilir və kiçik biznesdə yeni iş yrləri yaradılır.

Ən ümumi şəkildə dövlət müdaxiləsinin iki qrup tədbirlərinin adını çəkmək olar. Bu birbaşa üsullar və dolayı üsulla müdaxilədir. (Anşin V.M., Daqayev A.A., 2007. səh.6).

Dolayı üsullara innovativ məhsulların reallaşdırılmasından əldə olunan gəlirlərə əlverişli vergi rejiminin yaradılması, intelektual mülkiyyətin səmərəli müdafiəsi sisteminin yaradılması, kapitl bazarının inkişaf etdirilməsi, sahibkarların öyrədilməsi, məsləhətlərin verilməsi, perspektivli layihələr və potensial investorlar barədə məlumatın yayılmasını aid etmək olar.

Birbaşa üsullar kimi dövlətin vençur fondlarında iştirakını və ya birbaşa vəsaitlərin ayrılmasını, vençur kapitalı fondlarına öz vəsaitlərini yatıran investorlar üçün maliyyə zəmanətinin təmin edilməsini, vençur kapitalına potensial investorların cəlb edilməsinə yönələn dövlət tənzimləməsinin adını çəkmək olar.

Innovativ inkişaf elmi-tədqiqat və təcrübə-konstruktor işləri ilə sıx bağlıdır. Azərbaycanda son illərdə belə işlərə ciddi diqqət yetirilir. Innovativ texnikaya nümunə kimi Azərbaycana gətirilən New Holland kombaynını misal gətirmək olar. Polşada istehsal olunur. Onları innovativ edən isə bu kombaynın dağlıq ərazilərdə məhsul yığımını həyata keçirməsidir. texnika frmerə yığımı operativ aparmağa və məhsulu itkisiz əldə etməyə imkan verir. Azərbaycanın aqrar sahədə digər trendi və innovasiya laihəsi aqrodronlardır. onlar bizim ölkədə istehsal olunur və fermerlərə ərazini kübrələmək üçün təqdim olunur. bu dronlar ekoloji təmiz məhsul yetişdirməyə və ərazini çirkləndirməməyə imkan verir. bundan başqa aqrar sahədə yeni innovativ xidmət də təklif olunur. Bu fermer və mexanizator arasında komutator olan Aqrouber aqrosrvis xidmətidir. aqrotexnikanın izlənməsi üçün GPS-lərdən istifadə edilir.

## Nəticə

Bizim fikrimizcə, innovativ inkişaf üçün qanunvericilik səviyyəsində tədqiqatlar və işləmələr fondunu formalaşdırmaq lazımdır. Müəssisələr elmi tədqiqatların həyata keçirilməsini istifadə etmək üçün gəlirindən və ya xalis mənfəətindən müəyyən faiz fonda pul keçirsələr bu innovasiya texnoloiyalarının inkişafına və tədbiqinə müsbət təsir edər.

Fondun formalaşdırılması sahənin struktur mənsubiyyəti üzrə də mümkündür. Bu zaman sahə üzrə innivativ inkişafı koordinasiya edən ixtisaslaşmış şura yaratmaq olar. Şuranın vəzifələrinə elmi tədqiqatların və təcrübə konstruktor işləmələrinin mütərəqqi istiqamətlərini aşkar etmək məqsədiylə elmi konfransların keçirilməsi, hər bir iştirakçının məqsədlərini və maliyyələşdirmədə iştirakını nizamlayan müqavilə münasibətlərinin qurulması daxil edilə bilər.

Nəticədə qeyd etmək istəyərdik ki, aqrar sahədə innovaiya yönümlü investisiyaların maliyyələşdirilməsinin tədqiqinə sistemli, kompleks elmi yanaşma onun inkişafına, investisiya fəallığının stimullaşdırılmasına, rəqabət üstünlüklərinin və digər faydanın əldə edilməsinə təkan verəcək.

## References

1. Ivanov V.A Methodological bases of innovative development agro-industrial complex. Economic and social changes: facts, trends, forecast. 2008. № 2. p. 25
2. Igonina L.L. Investments: Textbook, allowance. Publisher: M. Jurist. 2002, 480 p. 22-25
3. Trushin Y. National project on agro-industrial complex / Economist, 2006, №10.
4. Trushin Y. Modern approach of the state to the development of the economist. 2007,№11 p-67
5. Mamontov V.D., Kozhevnikova T.M. Institutional component of modernization of the agrarian sphere // Socio-economic phenomena and processes. Tambov, 2012. № 1
6. https://www.stat.gov.az/source/education/

7. Khomkin K.A. Innovative project: preparation for investment. M. Delo, 2010. 120 p.
8. Innovation management: concepts of multi-level strategies and mechanisms of innovative development: textbook. allowance / Ed. V.M.Anshina, A.A.Dagaeve 3rd ed. M. Delo, 2007. 584 p.
9. PDF] Agrarian policy of the region in terms of economic development innovation AV Gridchina, LL Orekhova… - … Journal of Economics …, 2016 - dergipark.org.tr
10. Improvement of the mechanism of state regulation of investment in the innovative development of the agrarian sector V.Klochan, I.Klochan-Baltic Journal of economic studies,2018- baltija publishing.lv
11. Investment possibilities in agricultural networks RO Ismatov, TY Dadaboev, SA Karabaev - Theoretical & Applied Science, 2019 - elibrary.ru
12. Sustainable development of the Ukrainian agrarian sector: perspectives and challenges L Mykhailova, N Stoyanets, A Mykhailov… - … and Perspectives in …, 2018 - ceeol.com

**Rəyçi: dos. E.A.Salahov**

Göndərilib: 28.11.2021 Qəbul edilib: 16.12.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/73/64-69

**Jalə İlham qızı Əzizova**
Bakı, Azərbaycan
ms.gulnar_babayeva@mail.ru

# BİZNES STRATEGİYASINDA İNNOVASİYALARIN İDARƏ EDİLMƏSİ

**Xülasə**

İnnovasiya strategiyasında "fərqliləşmə" təmin edəcək addımlar müəyyən edilməli və bu addımları atmaq üçün lazım olan tədbirlər də strategiyanı açıq şəkildə dəstəkləməlidir. Məqalədə qeyd olunur ki, müəssisənin bütün vahidləri isə innovasiya strategiyasının həyata keçirilməsində məsul olmalıdır. Bu səbəblə, strategiyanın əlaqədar vahidlər arasında qarşılıqlı təsir yaratmağı hədəfləyərək hazırlanması böyük əhəmiyyət daşıyır. İnnovasiyanın xüsusilə sistematik ekoloji analizdən sonra gələcəyə yönəlmiş dəyişmələri, istehlakçı davranışlarını və texnoloji inkişafları izləyərək strategiya inkişaf etdirən, yəni xarici mərkəzli prosesi izləyən müəssisələrdə daha ön plana çıxdığı görünür.
***Açar sözlər:*** *biznes, innovasiya, idarəçilik, müəssisə, rəqabət, məhsul*

## Management of innovations in business strategy

**Summary**

The innovation strategy should identify steps that will ensure "differentiation" and the measures needed to take these steps should clearly support the strategy. The article notes that all units of the enterprise should be responsible for the implementation of the innovation strategy. For this reason, it is important to develop a strategy aimed at creating interactions between the relevant units. Innovation seems to come to the fore, especially in enterprises that develop strategies by tracking future changes, consumer behavior, and technological developments after a systematic environmental analysis.
***Key words:*** *business, innovation, management, enterprise, competition, product*

## Giriş

İqtisadiyyatın inkişafının, səmərəliliyinin yüksəldilməsinin və rəqabətlilik qabiliyyətinin artmasının əsas amili innovasiya fəaliyyətidir, bazis və yaxşılaşdınçı innovasiyaların mənimsənilməsi və yayılmasıdır. O, sosial-iqtisadi və texnoloji inkişafın proqramlaşdırılmasının, stratejiyə indikativ planlaşdırılmasının, proqnozlaşdırılmasının vacib obyektidir.

İnnovasiya fəaliyyəti məhsulların rəqabətlilik fəaliyyətini yüksəltmək üçün elmi-texniki nailiyyətlərdən istifadədir, gəlirlərin artırılması və ya digər səmərəli effektlərin alınmasıdır.

İnnovasiyalar bütün sosial-iqtisadi inkişaf sferalarında həyata keçirilir, onlar yenilik, yayılma sferası və alman nəticələrin, səviyyələri ilə seçilir.

Makroiqtisadiyyatın strateji planlaşdırılması və proqnozlaşdınlmasının əsas predmeti texnika və texnologiyanın yeni nəslinin, radikal ekoloji, təşkilati - idarəetmə və sosial innovasiyaların mənimsənilməsi və yayılması üçün texnoloji bazis innovasiyalarıdır. Yeni texnika modellərinin, texnoloji modifikasiyalarının, istehsalatın təşkilinin və idarə edilməsinin əsasında artıq mənimsənilmiş bazar piştaxtalannm genişləndirilməsinə istiqamətləndirilmiş bu sferalardakı yaxşılaşdırıcı, təkmilləşdirici innovasiyalar mikrosəviyyədə korporativ strateji planlaşdırmanın və proqnozlaşdırmanın predmetidir (1, s.67).

İnnovasiyaların mənimsənilməsi qeyri-bərabər həyata keçirilir, müxtəlif davametmə müddətli tsiklərə müvafiq olaraq bu proses tətbiq edilir. İnnovasiyaların sürətli inkişafı depressiyanın sonundakı fazada alınır və iqtisadiyyatın canlanmasını, əsas kapitalın innovasiyalı yeniləşməsini, əsasən iqtisadi tsiklin bu fazadakı innovasiya süni canlanmasının məzmununu ifadə edir, əsasını təşkil edir.

İnnovasiya həyata keçirməyən sahibkarlar rəqabətlilik qabiliyyətini itirirlər və iflasa uğrayırlar. Səmərəli innovasiyalar həyata keçirən sahibkarlar isə müəyyən müddət ərzində (yeni texnologiyalar və ya məhsullar tam yayılana qədər) əlavə innovasiya gəlirləri, texnoloji üstünlük əldə edir.

**Əsas hissə**

Son zamanlar qabaqcıl şirkətlərdə məqsədyönlü şəkildə strateji istiqamətləndirmə izlənilir. Bu ilk növbədə, üstün texnologiyadan, elmi-texniki son uğurların operativ istifadə edilməsinin yüksəldilməsi, bazarda hissəsinin axtarılması və planlarının işlənilməsi sferalarında rəqabət qabiliyyətinin yüksəldilməsilə bağlıdır. Nəticə etibarı ilə yenilik prosesinin idarə olunmasının müasir metod və yaxınlaşmalarına olan tələbat çoxalmışdır (4, s.17).

Dövrümüzdə inovasiya əməliyyatlarının idarə olunması sahəsində ən effektiv metod program-məqsədli yanaşma metodu hesab olunur. Belə ki, innovasiyanın tətbiq edilməsinin praktiki nəticələri ancaq o vaxt yüksək ola bilir ki, idarəetmə niyyətli sistemə əsaslandırılsın. Bu cür sistem məlum ierarxiyanı bir-biriylə uyğunlaşdırır. Bundan əlavə, idarə edilməyə program məqsədli yanaşma konkret özünüdarəetmə funksiyalarını özündə daşıyan dinamik təşkilati quruluşun formalaşmasına imkan verir. Hazırlanmış ierarxik model imkan verir ki, bütün ehtiyatlar qarşıya qoyulan məqsədlərin yerinə yetirilməsinə doğru yönəlsin. Bir çox səviyyə zənciri kompleks xarakter daşıdığı üçün inovasiya prosesinin inkişafi və idarə edilməsi məsələlərin tam şəkildə həll edilməsinə tabe olur. Program-məqsədli yanaşmanın başlıca prinsipləri aşağıdakılardan ibarətdir;

• programın sonuncu məqsədi dəqiq şəkildə müəyyən olunsun, onun nəticəsi və həmçinin ona nail olmağın qaydaları formalaşdırıla bilsin;

• idarə olunan prosesin planlaşdırılması, son programa münasibətdə kompleks sürətdə aparılması, yəni işin xarakterindən və icraçıların müəssisənin ayrı-ayrı bölmələrinə mənsub olmasına baxmayaraq, məqsədin reallaşdırılması üçün mühüm olan, planda nəzərdə tutulan bütün işlər reallaşdırılmalıdır;

• istənilən məsələnin və programın müəyyən bir hissəsinin icra olunmasında şəxsi cavabdehlik müəyyən edilir (12, s.98).

Beləliklə, İstənilən iqtisadi subyektin fəaliyətinin idarə olunmasına onun məqsədinin müəyyən olunmasından başlanılır. Misal üçün, təşkilat özü qarşısına məlum miqdar mənfəət qazanmaq, satış bazarında bir yaxud da bir neçə seqmenti “zəbt” etmək, ödənilmiş dividendin məlum ölcüsünə nail olmaq kimi qarşısına məqsədlər qoya bilər. Qarşıya qoyulmuş məqsəd bir tərəfdən müəsisənin sahədə real vəziyəti, ölçüsü (iri, orta, kiçik), inkişafı (intensiv, ekstensiv), bazar davranışı (bazarın fərqli sektorlarına differensesiya edilmiş yanaşma olmaması; ayrı-ayrı bazar sahələrinə çıxmaq imkanı), təşkilati qruluşu və bu kimi faktorlarla uzlaşdırılmalıdı. Başqa tərəfdən, qeyd olunan faktorlar məqsədin reallaşdırılması dövründə dəyişə bilər.

Çox vaxt, müəssisə öz məqsədlərini müəyyənləşdirdikdən sonra, ona nail olmaq strategiyasını ərsəyə gətirir. İdarəetmə sistemində 3 tip strategiya müəyyən olunur: funksional strategiya; korperativ strategiya; ayrı-ayrı təsərüfat vahidlərinin strategıyası. Korperativ strategiya - ümumilikdə müəsisənin perspektiv şəkildə inkişafini müəyyənləşdirir.O,müəsisənin missiyasının tamamlanmasına istiqamətlənir və müəssisənin fəaliyyətinin başlıca məqsədi olan - maksimum mənfəət qazanmasına xidmət edir. Korperativ strategiya səviyəsində təsərrüfat fəaliyyəti növünün seçilməsi, müəsisənin uzunmüddətli rəqabət üstünlüyünün saxlanması; resursların ayrı-ayrı stratejik zonalar üzrə paylaşdmlması kimi vacib məsələlər üstün səviyəli menecerlər tərəfindən icra edilir [8, s.98].

Müəssisədə funksional strategiya hazırlanarkən hər bir fəaliyət istiqamətləri üzrə, ən başlıca funksional hissələri tərəfindən formalaşdırılır. Həmin strategiya aşağıdakı istiqamətlərdə işlədilə bılər: marketing, istehsal, maliyə, heyət, innovasiya və investisiya.

Müəsisənin funksional olan strategiyası - onun korperativ strategiyasının daha da dərindən tədiqiq edilməsində (müəssisənin başlıca məqsədinin reallaşdırılmasına) və ayrı-ayrı təsərrüfat vahidlərini resurs təminatına yönəlir.

Əsas funksional bölmələrin strategiyalarının işlənilməsi ilə funksional bölmənin menecerləri məşğul olur.

Təsərüfat vahidlərinin strategiyası - (biznes-strategiyası çox vaxt iki məqsədin – dəqiq növ məhsulun rəqabət üstünlüynü təmin etmək və onun mənfəətliliyinin yüksəldilməsinə xidmət göstərir.

Belə səviyyədə qəbul olunan strateji həllər başlıca olaraq yeni məhsul növün yaradılması, əmtəəlik məhsul istehsalının genisləndirilməsi, və ya azaldılması, müasir texnologiyaların investsiyalaşdırılması, müəsisələrin yeni regionda işləmələri ilə və s. ilə bağlı olur. Bu səviyyədə strategiyaların işlənilməsilə,

korporativ strategiyanın işlənilməsilə məşğul olan menecerlərin məsləhəti və köməyilə biznes-vahidlərin rəhbərləri və menecerləri məşğul olurlar. Müəssisənin fərqli növ strategiyaları birlikdə müəsisənin strateji yığımı olaraq adlanır (7, s.23).

Müəssisənin effektiv inkişafının təmin olunmasında innovasiya strategiyasının işlənilməsi mühüm əhəmiyyət kəsb edir. Bu rol aşağıdakılarla xarakterizə olunur:

•hazırlanmış innovasiya strategiyası - müəsisənin uzunmüddətli inovasiya strategiyasının sosial və iqtisadi inkişafının reallaşdırılması mexanizmini təmin edir;

•o, xarici şəraitdə baş verən dəyişkən, dinamik proseslərin yeni perspektıv innovasiya imkanlarının istifadə olunmasını təmin edir;

•inovasiya strategiyasının işlənilməsi müəsisə tərəfindən nəzərə alma bilinməyən xarici mühit faktorlarının dəyişməsinə müvafiq strategiya variantlarının öncədən müəyyən olunmasını təmin edir və bununla müəsisə fəaliyyətinə mənfi təsiri minimuma salır;

•o özündə rəqabətdə olanla müqayisədə müəssisənin inovasiya fəaliyyətinin üstünlüyünü göstərir;

•müəssisənin inovasiya strategiyasının olması, perpektiv cari və operativ idarə etmə arasında dəqiq olaraq qarşılıqlı əlaqəni təmin edir;

•inovasiya strategiyası sistemində mühüm meyarlar əsasında inovasiyanın idarə olunması üzrə qərarlar qəbul olunur (9, s.76).

Bayaq qeyd edilən kimi, ən əsas funksional strategiyadan biri - məhz innovasiya strategiyasıdır. Həmin strategiyanın əsasında müəssisələrinin inovasiya siyasəti formalaşdırılır.

Müəsisələrin rəqabət qabiliyyətliyinin artırılmasında mühüm şərtlərdən biri müəsisələrdə davamlı şəkildə istehsalın texnologiyasının təkmilləşdirilməsidir. Bu da müəssisədə aparılan inovasiya siyasətinin vacib tərkib hissələrindən hesab olunur.

Aparılmış təhlil nəticəsində müəyyən olunmuşdur ki, uzunmüddətli planlarda yeni texnikanın və texnologiyaya kapitalın qoyulması iqtisadi artım və istehsalın effektivliyinin yüksəldilməsində həlledici amildir. Ancaq, bir amili nəzərə almaq lazımdı ki, əgər idarəetmə kifayət qədər səviyyədə olmasa müasir texnika və texnologiya istehsalın effektivliyinin artırılmasını təmin etməyəcək və nəticədə müəssisənin effektivliyi öz əvvəlki səviyəsindən də aşağı enəcəkdir. Sadəcə bunu demək olar ki, yeni texnologiya və texnikanın istehsala tətbiq edilməsi istehsalın effektivliyinin çoxaldılmasına zəmanət verməyəcəkdir.

Demək, təzə texnika və texnologiyanın tətbiq edilməsi öz sırasında istehsalın idarə olunmasını çətinləşdirir və nəticə olaraq daha dəqiq və daha sürətli idarəetməni tələb edir. Dünyada bir sıra öncül firmaların təcrübəsindən məlumdur ki, əgər istehsalın idarə olunması lazımi səviyyədə qurulmasa müəsisə bazarda öz əvvəlki mövqesini də itirə bilər və bununlada effektivliyi aşağı enə bilər (10, s.82)

İstehsalın ən yüksək effektivliyinə nail olmaq məqsədilə istehsalın təşkil edilməsinin təkmilləşdirilməsində yeni investisiyalaşdırma bir çox tərkib hissələrə ayrılır. Göstərmək lazımdır ki, onların heç biri özünün əhəmiyyətinə görə məmuIatın lahiyələndirilməsi, konstruksiyalaşdırılması və işlənməsilə müqayisə oluna bilməz.

Sənayede bir sıra sektorların real vəziyyətinin təhlil edilməsi qeyd olunan fikrin doğruluğunu təsdiq etmişdir. Məhsulun layihələndirilməsi müəssisədə əmək məhsuldarlığı ilə və işin keyfiyyəti ilə bilavasitə bağlıdır. Məhsulun layihələndirilməsinin düzgün təşkil edilməsi hesabına istehsalın effektivliyinin və işin keyfiyyətinin artırılması layihələndirilmədə iki yanaşmaya əsaslanır:

1.Məmulatın asanlaşdırılması və onun tərkib hissələrinin azaldılması,

2.Məmulatın layihələndirilməsi onun texnologiyasının layihələndirilməsi və işlənilməsi ilə daha da sıx inteqrasiyasıdır.

Məmulatın konstruksiya çətinliyiliyi onu təşkil edən komponentlərinin funksiyalarının çoxaldılmasına səbəb olur. Bu isə öz növbəsində texnologiya xidmətinin qurulmasında onun daha çox elementlərinin mövcud olmasını tələb edir.

Deməli mürəkkəblik-istehsalın stabilliyinin və ahəngdarlığının pozulmasının başlıca səbəblərindəndir.

Texnoloji proseslərin stabilliyi istehsalın yüksək səmərəliliyinə nail olmağın başlıca şərtidir.

Mürəkkəblik məhsuldarlığı bir daha ona görə aşağı salır ki, keyfiyyətə nəzarət üçün əlavə problemlər yaradır. Bu isə əlavə resurs xərcləri və vaxt tələb edir.

Deməli məhsulun konstruksiya mürəkkəbliyinin aşağı salınması eyni zamanda əmək məhsuldarlığının və məhsulun keyfiyyətinin yüksəldilməsinə səbəb olur. Əgər bu məsələ ilə ciddi məşğul olunmazsa yeni məhsulun yaradılması istehsalın mürəkkəbliyini artıra bilər. ABŞ-ın qabaqcıl müəssisələrinin təcrübəsi əsasında müəyyən edilmişdir ki, məmulatın mürəkkəbliyinin aşağı salınması, onun komponentlərinin sayının azaldılması məqsədilə konstruksiya işlərinin əlavə olaraq aparılması eyni zamanda məhsulun keyfiyyətinin və məhsuldarlığının yüksəldilməsini təmin edir (11, s.76).

Müəssisənin rəqabət qabiliyyətinin artırılmasında yeni idarəetmə strategiyasının formalaşması ayrıca yer tutur. Yeni idarə etmə strategiyası müəsisədə investisiyanın strukturunun dəyişməsi ilə istehsalda inovasiya prosesinin təşkil edilməsi ilə, istehsala təzə texnika və texnologiyanın tətbiq edilməsi ilə birbaşa əlaqədardır. Onu da göstərək ki, müəsisədə strategiyanın dəyişməsi ümumi xərclərin səviyəsinin azaldılması həddində olmalıdır. Bu isə müəsisədə mütəmadi şəkildə istehsal xərclərinin azaldılmasını, istehsalın texniki səviyəsinin modernləşdirilməsini tələb edir.

İstehsalın təkmilləşdiriImsində ənənəvi şəkildə yanaşma aşağıdakılarla bağlıdır: (5, s.14)

•istehsalın texnologiyasında və məhsulda dəyişikliklərin həyata keçirilməsi marketinq tələbləri və ya muhəndis işləmələrinin nəticəsi ilə əlaqədar olur. İstehsalın cəldliyi mahiyyət etibarilə bu şərtlərə surətlə reaksiya verməkdir.

•istehsalın şərtlərinin azaldılması müxtəlif şəxslərin əmək məhsuldarlığının artırılması, məhsul çıxımının artırılması olduğu bir çox rəhbərlər tərəfindən qəbul olunur.

•istehsal prosesinin şaquli halda inteqrasiya olunması əməyin dərin texnolojik bölgüsünə əsaslanır. Nəticə olaraq, bir çox sahələrdə yerinə yetirilmiş ayrı-ayrı texnoloji əməliyatlar istehsal balanslılığını, istehsalın avadanlıqlarının sazlanmasını, hazır detalların və hissələrin bir yerdən başqa bir yerə daşınmasının balanslılığını pozur.

• Müəssisənin təsərrüfatçılığının aşağı səviyyədə olduğu dövrdə işçilərin bir qisminin işdən çıxarılmasının, yüksəldiyi dövrdə əlavə işçi qüvvələrinin işə cəlb edilməsini qəbul edirlər. Bu da düzgün deyildir.

• öz aralarında rəqabətdə olan mal göndərənlər, ən aşağı qiymətə mal satanlardan xammal və material almağa cəhd edir (3, s.89).

Yeni idarəetmə təfəkkürünə malik olanlar isə buraxılan məhsulun keyfiyyətinin yüksəldilməsinin istehsalın texnika və texnologiyasının dəyişdirilməsinin təkcə xarici mühit təsiri ilə deyil daxili mühit amillərilə əlaqədar olduğunu mütəmadi olaraq nəzərə alırlar.

Yeni investisiyanın səmərəliliyinin yüksəldilməsi və ən çox artıma nail olmaq məqsədilə istehsalın təkmilləşdirilməsini bir neçə tərkib hissələrə aynlır. Burada layihələndirmə, konstruksiyalaşdırma və yeni məhsulun işlənilməsi xüsusilə əhəmiyyətlidir. Yeni məhsulun layihələndirilməsi müəssisədə əmək məhsuldarlığının yaxşılaşdırılması ilə bir-başa əlaqədardır.

Məmulatın konstruksiya mürəkkəbliyi məmulatı təşkil edən komponentlərin funksiyası ilə bağlıdır, nəticədə məlum məmulat istehsalını mənimsəmək üçün yuxanda qeyd edilən tələbləri ödəyən texnoloji xəttlərin qurulmasını tələb edir. Məmulatın və texnologiyanın mürəkkəbliyi istehsalın dayanıqlığının və ahəngdarlığının düşmənidir. Texnoloji prosesin stabilliyi istehsalın yüksək səmərəliliyinə nail olmağın başlıca şərtidir. İstehsalın mürəkkəbliyi bir daha onunla əlaqədardır ki, məhsulun keyfiyyətinə nəizarət üçün əlavə problemlər yaradır, bu isə əlavə resurs xərcləri və vaxt tələb edir.

İstehsalın modernləşdirilməsində ən əsas yerlərdən birini yeni texnologiyanın və texnikanın tətbiq edilməsi tutur.

Rəqabət mübarizəsindən qalib gəlmənin ən vacib şərtlərindən biri də firmanın müasir yeni avadanlıqlarla təchiz etməklə yeni üstün məhsulların istehsal prossesinin mənimsənməsidir. Bu halda uzun dövr ərzində bu üstünlüyü əldə saxlamaq vacib şərtdir. Yeni məhsulların işlənməsinin və hazırlanmasının başlıca məqsədi bazarda pay uğrunda mübarizədir, bu zaman istehsalçıların və istehlakçıların marağı da mütləq nəzərə alınmalıdır.

Yeni texnologiyalar məhsulun istehsal xərclərinin azaldılmasını, məhsulun keyfiyyət və etibarlılığının yüksəldilməsini istehsalın çevikliyinin artırılması hesabına firmanın rəqabət qabiliyyətinin artmasını təmin edir.

Yeni məhsulun işlənilməsi və yeni texnologiyanın yaradılmasının ümumi səmərəliliyini artırır.

## Nəticə

Aparılmış təhlil nəticəsində müəyyən olunmuşdur ki, müəssisənin yeni məhsul istehsal etmək qabiliyyəti gələcək müvəffəqiyyətin əsas amilidir. Lakin bu qabiliyyət sadəcə olaraq müəssisənin tədqiqat xidmətlərinə diqqətin artırılması deyildir. Bu müəssisənin idarəetmə aparatının bütün bölmələrinin bacanqlı inteqrasiyasıdır. Yeni məhsulun yaradılması layihələrinə ənənəvi yanaşma ondan ibarətdir ki, idaərəetmə aparatının hər bir xidmət bölməsi özlərinin məhdud rolunu yerinə yetirirlər: mühəndislər yeni məmulatı işləyib hazırlayırlar; istehsalçılar onun həyata keçirilməsilə məşğul olurlar; marketinq və təhçizat işçiləri isə məhsulun reallaşması ilə məşğul olurlar (2, s.98)

Hər bir belə xidmət sahələrinin işinin səmərəliliyinin müəyyən edilməsi üçün məhdud meyarlardan istifadə edilir. Mühəndis layihəçi üçün yeni məmulatın yaxşı işlənilmiş konstruksiyası əsas göstərici hesab olunur.

Bu konstruksiya elə olmalıdır ki, mövcud analoji məhsulların konstruksiyalarından üstün olsun. Lakin müasir rəqabət şəraitində yeni məhsulun xarakteristikaları tamamilə başqa meyarlar əsasında ölçülür.

Ən başlıcası həmin məhsulun daha qiymətli olması, istehlakçılar üçün daha çox lazım olmasıdır. Bu zaman həmin məhsulun mövcud dünya standartlarına uyğun gəlib gəlməməsi bir o qədər vacib deyildir. Bu o deməkdir ki, istehlakçı aşağı qiymətə daha yüksək keyfiyyətli məhsul ala bilsin. Məhz dünya səviyyəli istehsalın mahiyyəti bununla səciyyələnir. Buna nail olmaq üçün yeni məhsulu layihələndirənlər, onu hazırlayanlar, reallaşdıranlar birgə işləməlidirlər və bir yekun məqsədə xidmət etməlidirlər.

Çox təəssüf ki, hal-hazırda əksər iri yüksək texnologiyalı və kiçik müəssisələr qiymət və qeyri-qiymət rəqabətinə əsaslanaraq yeni məhsulların işlənilməsinə köhnə qaydada yanaşırlar.

Yeni məmulatların eyni zamanda onun istehsalı texnologiyalarının işlənilməsi çox böyük hazırlıq işlərinin aparılmasını və bu məqsədə kifayət qədər resursların ayrılmasını tələb edir.

Odur ki, müəssisənin bütün xidmət sahələrini əhatə edən dəqiq strategiya tələb edilir.

Bu strategiya yeni məhsulu layihələndirənlərdən başlayaraq məhsulu reallaşdıranlaradək olan bütün işçilərin səyini özündə birləşdirir.

Sürətli inkişaf istiqamətinə nail olmağa çalışılan ölkəmizdə bir sıra yeni istehsallar yaradılacaq və mövcud istehsalların müasir tələblərə uyğunlaşdırılması məqsədilə geniş təkmilləşdirmə işləri aparılacaqdır. Bu baxımdan istehsalın təşklinin mütərəqqi formalarının öyrənilməsi və istehsala tətbiqi xüsusilə əhəmiyyətli olacaqdır.

## References

1. BHOT, Bhaskar, BOWENDER, Bş Creatıvıty and Inovatıon Management, Volume: 10, March. 2001
2. BIRKINSHAW, Julıan, BESANT, John, DELBRIDGE, Rıck. “Fındıng, Formıng and Performıng: Creatıng Networks for Dıscontınuous Innovatıon,” CalıfornıaManagement Revıew, 49, No. 3, 67-84. 2007
3. BOSSINK, B.A., Get (2002); “The Strategıc Functıon Of Qualıty In The Management Of Innovatıon”, Volume: 13, No: 2, Total Qualıty Management..
4. CHATMAN, Jennıfer, A., JEHN, Karen.A., (1994); “Assessıng the Relatıonshıp Between Industry Characterıstıcs and Organızatıonal Culture: How Dıfferent Can You Be?”, Academy of Management Journal, 37, No. 3, 522-53.
5. CORMICAN, Kathryn, O’SULLGVAN, Davıd (2004); Audıtıng Best Practıce for Effectıve Product Innovatıon Management, Technovatıon.

6. DOBNI, C.Broke (2010); Achıevıng Synergy Between Strategy and Innovatıon: The Key to Value Creatıon, Internatıonel Journal of Busıness Scıence And Applıed Management, Volume 5, Issue 1,49-58.
7. DRUCKER, Peter F. (1985); Innovatıon and Entrepreneurshıp, N.Y, Harper&Row Pub.
8. DRUCKER, Peter F. (1999); 21.Yüzyıl Içın Yönetım Tartışmaları, Çevıren; Irfan Bahçıvangıl-Gülenay Gorbon, Istanbul: Epsılon Yayınevı.
9. DRUCKER, Peter F. (2003); Yenılıkçılık Içerısınde Yenılıkçılık Dısıplını, Çevıren: Ahmet Kardam, Istanbul: MESS Yayınları.
10. ECEVIT Satı, Z. (2010); “Yenılık Yönetımı”, Teknolojı Yönetımı, Edıtör:Feray Odman Çelıkçapa, Saıt Kaygusuz, Bursa: Dora Yayıncılık.
11. FREEMAN, Chrıstopher, SOETE, Luc. (2003); “The Economıcs Of Industrıa Innovatıon” “Yenılık Iktısadı” Cev: Ergun Türkcan, 3 Basım, Ankara:Tübıtak 2003, s.Vlll
12. GOVINDARAJAN, Vıaj, TRIMBLE Chrıs; (2004); "Strategıc Innovatıon and the Scıence of Learnıng.", Volume: 45, No: 2, MIT Sloan Management Revıew.
13. HAMEL, Gary (ıntervıew by Tony Jackson) (1997); “The Dırty Lıttle Secret of Strategy”, Aprıl 24 Fınancıal Tımes.
14. HIGGINS, J. M., (1996); “Innovate or Evaporate: Creatıve Technıques for Strategıst”, Long Range Plannıng, Vol: 29, No: 3.

**Rəyçi: dos. N.Axundova**

Göndərilib: 01.12.2021 Qəbul edilib: 19.12.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/73/70-75

**Aysel Şakir qızı Süleymanova**
Azərbaycan Dövlət Aqrar Universiteti
assistent
mehdizade-2017@bk.ru

# AQRAR SAHƏDƏ İNNOVASIYA YÖNÜMLÜ İNVESTİSİYALARIN MALİYYƏLƏŞDİRMƏ MƏNBƏLƏRİ

**Xülasə**

Müasir zamanda aqrar sahənin inkişaf etdirilməsinin əsas istiqaməti aqrar sahədə innovasiyaların işlənib hazırlanması və tədbiq edilməsidir. Aqrar sahədə fəaliyyət göstərən müəssisələrdə maliyyə vəsaitlərinin az olması innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsi problemini aktuallaşdırmışdır. Bu sahədə yeni maliyyə resurslarının araşdırılıb tədbiq edilməsi zərurətə çevrilmişdir. Məqalədə innovasiya yönümlü investisiyaların maliyləşdirmə mənbələri tədqiq edilmiş və onların Azərbaycanın aqrar sahəsində tədbiqi imkanları araşdırılmışdır. Azərbaycanda innovasiya proseslərinin ləngiməsinin səbəbləri göstərilmişdir. Yaranmış şəraitdə aqrar sahədə buraxılan məhsulun rəqabət qabiliyyətinin yüksəldilməsi yeni məhsul növlərinin işlənib hazırlanmasını, yüksək keyfiyyət və qiymət üstünlüklərini təmin edə bilən innovasiya fəaliyyətindən asılı olduğu qeyd edilmişdir. Innovasiyaların tədbiqi üçün aqrar istehsalçıların məqalədə göstərilən maliyyə rsurslarına çıxış imkanlarını genişləndirmək, iqtisadi, təşkilatı və sosial xarakterli dövlət tənzimləməsi və dəstəyi mexanizmlərini təkmilləşdirmək lazım olduğu vurğulanmışdır.

***Açar sözlər:*** *innovasiya, investisiya, maliyyələşdirmə, aqrar sahə, maliyyə mənbələri, vençur kapitalı, kredit*

## Sources of financing of innovationoriented investments in the agricultural sector

**Summary**

In modern times, the main direction of the development of the agricultural sector is the development and application of innovations in the agricultural sector. The lack of financial resources in enterprises operating in th eagricultural sector has highligted the problem of financing innovation-oriented investments. It has become necessary to study and apply new financial resources in this area. The article examines the sources of financing innovation-oriented investments and their application in the agricultural sector of Azerbaijan. The reasons for the delay in innovation processes in Azerbaijan are indicated. It was noted the increase in the competitiveness of agricultural products depends on the development of new types of products, high quality and price advantages, as well as innovation activities. It was emphasized that in order to implement innovations, it is necessary to expand the access of agricultural producers to the financial resources mentioned in th earticle, and to improve the mechanism of state regulation and support of economic, organizational and social nature.

***Key words:*** *innovation, investment, financing, agriculture, financial sources, venture capital, credit*

## Giriş

Bu gün qlobal miqyasda ərzağa olan tələbatın artması, qida məhsullarına olan qiymətlərin yüksəlməsi və əmtəə təklifini qeyri-müəyyən edən kəskin iqlim dəyişikliklərinin baş verdiyi bir zamanda kənd təsərrüfatı məhsulları istehsalının sabitləşdirilməsinin ən vacib amillərindən sayılan aqrar sahənin innovasiya yönümlü inkişafına daha çox diqqət yetirilir. Aqrar sahədə fəaliyyət göstərən müəssisələrdə maliyyə vəsaitlərinin az olmasını beynəlxalq ekspertlər inkişaf etməkdə olan ölkələrin milli aqrar sektorlarının inkişafındakı böhran hallarının əsas səbəblərindən biri hesab edirlər. Iqtisadi böhran aqrar istehsalçıların maliyyə problemlərini daha da dərinləşdirir və aqrar sahədə elmi tədqiqatların maliyyələşdirilməsini daha da çətinləşdirir. Bununla yanaşı, FAO ekspertlərinin qeyd edirlər ki, yalnız aqrar sahədə elmi tədqiqatların maliyyələşdirilməsinin həcminin artırılması bu sahədə fəaliyyət göstərən və iqtisadi böhranlardan daha çox əziyyət çəkən xırda əmtəə istehsalçılarına

resurslardan daha səmərəli istifadə etməyə və yüksək maliyyə nəticələri əldə etməyə imkan verir. (А.Клименко Nr 1(2014))

Müasir zamanda aqrar sahənin dayanıqlı inkişafının əsas şərtlərindən biri sahənin innovasiya yönümlü inkişaf etdirilməsidir. Bu inkişafınnəticələri daxili və xarici iqtisadi mühitin vəziyyətindən, innovasiya yönümlü məhsulun tədbiqi və səmərəli istifadəsi üçün zəruri şəraitin olmasıdır. Davamlı olaraq innovasiya yönümlü inkişaf yoluna keçirilməsi əsasında aqrar sahənin dayanıqlı inkişaf etdirilməsi problemi son illər yerli aqrar iqtisadiyat elmi sahəsində çalışan alimlər tərəfindən geniş müzakirə olunur. Sahənin bu günkü vəziyyəti, maddi-texniki bazanın inkişaf etdirilməsi, innovasiya yönümlü fəaliyyətdə aqrar elmin rolu təhlil edilir. Lakin bu proseslərlə bağlı bir sıra nəzəri, metodoloji və praktiki məsələlər həll olunmamış qalır və əsaslandırılmalıdır. Belə məsələlərdən biri də aqrar sahənin innovasiya yönümlü inkişafını təmin etmək üçün iqtisadi mexanizmin işlənib hazırlanması, investisiya qoyuluşlarının maliyyələşdirilməsi mənbələrinin seçilməsi və istifadə edilməsidir. Innovasiya yönümlü investisiyalrın maliyyələşdirilməsi sisteminə maliyyə resurslarının çoxaxınlı mənbələri, yığılmış vəsaitlərin qoyuluş prinsipləri, investisiyaların istifadəsinə nəzarət mexanizmi, onların geri qaytarılması və innovasiya yönümlü investisiya layihələri daxildir.

Aqrar istehsalın mürəkkəbliyi və səciyyəvi xüsusiyyətləri innovasiya yönümlü investisiyaları yüksək riskli edir və onun maliyyələşdirilməsinə özünəməxsus yanaşma tələb olunur. Bu risklərə innovasiyaların maliyyələşdirilməsi riski, innovasiyalara çəkilən xərclər və onun nəticələri arasında böyük zaman kəsiyinin olması riski, innovativ məhsula tələbin qeyri-müəyyənliyi riski özəl investorları bu sahənin inkişafına investisiya qoyuluşları etməyə maraqlandını artırmır (Мамонтов В.Д., Кожевникова Т.М. 2012. № 1).

Aqrar sahədə innovasiya proseslərini fəallaşdırmaq üçün bu sahədə geniş təkrar istehsal üçün şəraiti təmin etmək lazımdr ki, təşkilatın maliyyə vəziyyəti yaxşılaşsın. (Кожевникова Т.М., Бельченко О.А., Коломейцева М.А., 2011. № 9.)

Aqrar sahənin innovasiya yönümlü inkişafı təminatlı maliyyələşdirmə sisteminin yaradılmasını nəzərdə tutur. Yalnız bu vaxt yığıma və maliyyə vəsaitlərini təmərgüzləşdirməyə və lazımi istiqamətdə istifadə etməyə şərait yaratmaq olar.

Innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsi üçün maliyyə sistemini yaradakən aşağıdakılar nəzərə alınmalıdır:

-sistem dəqiq məqsədə innovasiyaların tez bir zamanda və səmərəli tədbiqinə hədəflənməlidir;

-istifadə edilən fənd və mexanizmlər məntiqi, əsaslandırılmış olmalı və hüquqi baxımdan müdafiə olunmalıdırlar;

- maliyyələşdirmə mənbələri çox olmalıdır və s.

Innovasiya yönümlü investissiyaların maliyyələşdirilməsi mənbələri aşağıdakılardır:

-dövlət və region səviyəsndə ayrılan büdcə ayırmaları;

-müəssisələrin, regionların idarəetmə orqanlarının yaratdığı ETTKİ-n maliyyələşçdirilməsi üçün xüsusi büdcədənkənar fondların vəsaitləri;

-təsərrüfatların öz vəsaitləri (mənfəətdən və istehsal xərclərinin tərkibinə daxil edilən investisiyalar);

-müxtəlif tipli kommersiya qurumlarının (kommersiya bankları, sığorta şirkətləri, investisiya kompaniyaları və s.) vəsaitləri;

-hökümətin xüsui səlahiyyətlər verdiyi investisiya banklarının kredit resursları;

-xarici investisiyalar, o cümlədən xarici elmi fondların vəsaitləri;

-fiziki şəxslərin əmanətləri.

İlk növbədə işə salınan mənbələr innovasiya müəlliflərinin, onlaın ailələri və dostlarının şəxsi vəsaitləridir. bu mənbələr “3Fs” (family, fiends, fools) adlanırlar təbii ki bu vəsaitlər çox az olur. Lakin bu kifayət edir ki, layihənin özünün nə dərəcədə ardıcıl olmasına əminlik yaransın. Bu cür mənbələr tez-tez yaranır, vəsaitlərin uçotuna qeyri-formal yanaşma olduğundan və mənbənin təbiəti aydın olmamadığından gələcək üçün müəyyən dərəcədə təhlükəlidirlər (bilmək olmur borcdur, yoxsa biznesə yatırım).

Ideyanın yaradıcılarının vəsaitləri ilə yanaşı dövlət və qeyri-dövlət fondlarının vəsaitləri də cəlb edilə bilər. bu fondlardan vəsaitləri müraciət edənlərə bir neçı nümunəvi formada təqdim olunur /qeyri-

kommersiya fondlarının qrantları, güzəştli zəmanətsiz kreditlər, faiz dərəcəsi kompensasiya edilən kreditlər, vençur investissiyaları və s. (К.И. Колесов 2017. 118 с.)

Hüquqi şəxslərin həyata keçirdiyi innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsi mənbələri onların öz vəsaitlərindən (mənfəətin yenidən maliyyələşdirməyə istifadə olunan hissəsi, amortizasiya ayırmaları, ziyanın ödənilməsi üçün istifadə olunan sığorta məbləği, qeyri-maddi aktivlərin reallaşdırılmasından əldə olunan vəsaitlər və s.); cəlb edilmiş vəsaitlərdən (səhm və digər qiymətli kağızların emissiyası, qaytarmamaq şərti ilə verilən vəsaitlər); borc vəsaitlərdən ibarət olur (büdcə, kommersiya və bank kreditləri). (*И.О. Боткин, Л.Г. Ким* 2013. Вып. 1)

Azərbaycanda innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsinin əsas mənbələri aşağıdakı cədvəldə verilmişdir.

Cədvəl 1

**Tədqiqat və işləmələrə çəkilən daxili xərclərin maliyyə mənbələrinə görə bölgüsü**

| | 2018 | 2019 | 2020 |
|---|---|---|---|
| Tədqiqat və işləmələrə çəkilən daxili xərclər - cəmi, min manat | 147 468,3 | 163 890,4 | 162 452,5 |
| o cümlədən maliyyə mənbələri üzrə: | | | |
| büdcə vəsaiti | 101 323,2 | 120 553,8 | 122 735,5 |
| büdcədən kənar vəsait | 824,9 | 950,8 | 1 271,2 |
| öz vəsaiti | 14 073,6 | 12 130,7 | 9 436,2 |
| sifarişçinin vəsaiti | 31 246,6 | 30 255,1 | 29 009,6 |

Mənbə https://www.stat.gov.az/s

Apardığımız araşdırmadan göründüyü kimi, tədqiqat və işləmələrə çəkilən xərclərin həcmi 2020-ci ildə 2018-ci ilə nisbətən 10% artmışdır. Maliyələşmə mənbələrindən büdcə vəsaitlərinin payına 2020-ci ildə xərclərin 75,6%, büdcədən kənar vəsaitlərin payına 0,8%, öz vəsaitlərinin payına 5,8%, sifarişçinin vəsaitlərinin payına isə 17,8% düşür.

2020-ci ildə ölkədə tədqiqat və işləmələrin 64,1% dövlət sektorunun təşkilatları, 7,6% sahibkarlıq sektorunun təşkilatları, 28,3% isə ali təhsil sektorununtəşkilatları tərəfindən yerinə yetirilmişdir.

**Şəkil 1. Azərbaycanda 2020-ci ilin sonuna tədqiqat və işləmələri yerinə yetirən təşkilatların sektorlar üzrə bölgüsü, faizlə**




Aqrar sahədə fəaliyyət göstərən iri kompaniyalarda innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsinin ən geniş yayılmış forması səhm və ya digər qiymətli kağızların buraxılması və xalis mənfəətdən istifadə edilməsidir. Lakin qeyd etmək lazımdır ki, axırıncı halda tədqiqatlara və işləmələrə investisiya qoymaq deyil dividend almağa ümid edən aksiya sahiblərinin maraqları ilə münaqişə yaranır. Səhmlərin əlavə olaraq emissiya edilməsi səhmlərin daxili və xarici bazarlarda

yerləşdirilməsi vasitəsiylə maliyyə resurslarına tez bir zamanda çıxmağa imkan verir, lakin sonradan onlar üzrə də dividend vermək lazım gəlir və yalnız maliyyə göstəriciləri yaxşı olan şirkətlərin səhmlərini müvəffəqiyyətlə yerləşdirmək üçün imkanları var.

ABŞ və Avropa ölkələrində aqrar sahədə innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsində dövlət tərəfindən maliyyələşdirmə dah çox inkişaf etmişdir. Yaponiyada innovasiyaların korporativ şəkildə maliyyələşdirilməsi institutları inkişaf etmişdir və burada dövlət maliyyələşdirməsi ilə yanaşı özəl investisiyalar da geniş yayılmışdır. Yaponiyada innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsində özəl investisiyaların payı 80% təşkil edir. Maliyyələşdirmənin ən mobil forması olan vençur kapitalı əsasən özəl mənbələrə əsaslanır. (В.М.Аньшина, А.А.Дагаева., 2007. 584 с.)

Innovasiya layihələrinin maliyyə ilə yaxşı təmin olunması innovasiyanın bazar tərəfindən rədd olunması riskini azaldır. Bu səbəbdən də innovasiya fəaliyyətinin maliyyələşdirilməsi sistemində maliyyə mənbələri və alətləri mühüm yer tutur.

Innovasiya yönümlü investissiyaların maliyyələşdirilməsi mənbələri özününkü, cəlb olunmuş və borc vəsaitləri olabilər. Yerdə qalanları isə maliyyələşdirmənin alətləridir. Lakin bu barədə fikirlər fərqlidir. Məsələn, belə bir fikir də var ki lizinq maliyyələşdirməsi müəssisəlr üçün vəsaitlərin müstəqil mənbəyidir. (Черных К.С., 2015. - №27 (71))

Qarışıq maliyyələşdirmə innovasiya yönümlü investisiyaların maliyyələçdirilməsi üçün lazım olan maliyyə axınlarının birləşməsidir.

Innovasiya yönümlü investisiyaların maliyyə mənbələrini araşdırarkən belə bir nəticəyə gəldik ki, bu mənbələrdən birincisi şəxsi vəsaitlərdir. Özünümaliyyələşdirmə bir neçə üsulla həyata keçirilə bilər:

a) Inkişaf məqsədləri üçün bölüşdürülən mənfəət. Mənfəətin artıqlarını innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsinə yönəltmək imkanı var. Bu zaman innovasiya layihəsi özünü doğrultmasa və ya ziyan gətirsə belə investor yalnız öz kapitalı ilə risk edir. Borc vəsaiti üçün əlavə xərc çəkməyəcək;

b) Amortizasiya fondu. Əsas vəsaitlərin köhnəlməsinin dəyər formasında yığılması sistematik olaraq hər ay baş verir, eyni zamanda əsas istehsal fondlarını təkrar istehsalın hər dövründən sonra natural formada yeniləməyə ehtiyac olmur. Nəticədə azad pul vəsaitləri formalaşır ki, onları innovasiya yönümlü investissiyaların maliyyələşdirilməsinə yönəltmək olar. Bununla yanaşı əsas vəsaitlərin normativ istismar müddətinin süni olaraq azaldılması hesabına sürətləndirilmiş amortizasiya imkanı da var. Qeyri-mddi aktivlərin bir hissəsi kimi intelektual mülkiyyət obyektlərini sürətləndirilmiş amortizasiya etmək olar. (http://center-yf.ru/data/economy/Innovacionnaya-deyatel nost. php);

c) Qrant (grant) – konkret innovaiya layihəsini reallaşdırmaq üçün sponsorun fiziki şəxsə və ya müəssisəyə əvəzsiz verdiyi vəsaitlərdir. bu cür maliyələşdirmə aləti dövlət maliyyəsi, mülkiyyət və ya innovasiya yönümlü fəal təşkilatların elmi-tədqiqatları və işləmələri hesabına dəstək və stimullaşdırmanı həyata keçirir. İlkin olaraq bu alətin istifadəsi nəzərdə tutur ki, işlər yekunlaşana qədər sponsopun innovasiya layihəsinin reallaşdırılması prosesinə nəzarət və ya müdaxilə etməyə ixtiyarı yoxdur. Layihənin nəticələri qeyri-müəyyən xarakter daşıyan və ya bilavasitə xeyir gətirə bilməyən tədqiqatlar və işləmələr xüsusiylə tez-tez qrant qazanırlar. Bunula bğlı olaraq qrantı həm öz vəsaitlərinə, həm də cəlb olunmuş vəsaitlərə aid etmək olar; - cəlb olunmuş vəsaitlər.

a) Səhm hesabına maliyyələşmə. Maliyyələşdirmə alətinin bu forması səhmdar cəmiyyəti formasında yaradılan müəssisələrdə mümkündür. Bu onlara səhmlərini çoxsaylı investorların arasında yerləşdirmək hesabına böyük maliyyə resurslarını cəlb etməə imkan verir.

b) cəlb olunmuş vəsaitlərə geri qaytarılmayan əsaslarla verilən vəsaitlər (qrantlar), habelə ianələr aiddir.

- borc vəsaitləri.

a) Vençur maliyyələşdirilməsi. Bu maliyyələşdirmə risk kapitali fondlari tərəfindən həyata keçirilir, pul vəsaitlri faizsiz əsaslarla və onların geri qaytarılması üzrə zəmanət olmadan təqdim olunur. Lakin vençur maliyyələşdirməsi nizamnamə kapitalında payın və ya səhm paketinin əvəzinə həyata keçirilir.

Bu investorların riski böyükdür, lakin uğur qazanılarsa risk yüksək mənfəətlə kompensasiya olunur. Statistik məlumatlara əsaslanaraq demək olar ki, vençur kapitalının iştirakı ilə maliyyələşən innovasiya yönümlü layihələrin 15% tam yanırlar, 25%-i uzun müddətd ərzində ziyan çəkirlər, 30% birinci illərdə

az mənfəət alırlar, qalan 30%-də isə vençur firmaları həddindən yüksək mənfəət əldə edirlər (bu halda risk kapitalından 30-200 dəfə artıq). Vençur maliyyələşdirməsi zamanı mümkün olacaq riskləri layihələri düzgün seçməklə və vəsaitləri eyni zamanda bir neçə reallaşdırılması müxtəlif mərhələlərdə olan innovasiya layiəsinə yatırmaqla azaltmaq olar. (ttp://projects.innov business.ru/content/ document_r_FE10E07E-EA69-4B9F-95FB-EB2CB68 FBF1F.html).

Bu fondların fəaliyyətində onları adi investisiya fondlarından fərqləndirən bir sıra səciyyəvi xüsusiyyətlər vardır:

1) investorlar öz kapitalını itirməyə hazırdırlar və yatırdıqları vəsaitlərin qaytarılmasına zəmanət tələb etmirlər;

2) vençur maliyyələşdirilməsində kapital uzun müddətə 5 ildən 7 iləfək təqdim edilir.

3) kapital yalnız səhm kapitalı formasında yerləşdirilir.

Qeyd etmək lazımdır ki, çox vaxt vençur kapitalını təqdim edən investor innovasiya müəssisəsinin sahibi olurlar. (Электрон. науч. жур. – 2011,).

b) Lizinq üzrə maliyyələşdirmə - burada natural formada əqdim olunan və hissə-hissə ödənilən uzunmüddətli kredit şəklində borc vəsaitləri cəlb olunur. maliyələşdirmə zamanı lizinq verən konkret satıcıdan lizinq alanın göstərdiyi əmlakı alır və danışılan vaxt onu lizinq alana təqdim edir bir qayda olaraq lizinq müqaviləsinin müddəti aldığı əmlakın tam amortizasiya müddətindən artıq və ya ona bərabərdir. müqavilə müddəti bitdikdən sonra əmlak lizinq müqaviləsi üzrə məbləğ tsm ödənilibsə lizinq alanın mülkiyyətinə keçirilir.

c) investisiya yönümlü vergi krediti mənfəət və ya gəlir vergisinin ödənilməsi müddətini dəyişməyi nəzərdə tutur. Bu zaman təşkilatın vergi üzə öz ödənişlərini və sonradan mərhələ üzrə kreditin məbləğini və hesablanan faizləri müəyyən müddətə və müəyyən şərtlərlə azaltmaq imkanları var.

Dövlət öz borcalanına vergi ödənişlərinin vaxtını uzatmağa imkan verir, deməli həmin müəssisənin bunun hesabına qənaət etdiyi pul vəsaitlərini istifadə etmək imkanı yaranır çünki, onun vergilərin ödənilməsi üzrə xərcləri xeyli azalır. Müəssisə innovasiya investisiyalarını maliyyələşdirmək üçün ona lazım olan vəsaitləri məhz bu cür əldə edir. Lakin bu kredit müəyyən bir müddətə və adətən aşağı olan müəyyən faizlə verilir.

d) Bank kreditləri банковские кредиты. kommersiya bankları real ödəmə müddəti olan, yəni ödəmə müddəti onun reallaşması müddətindən az olan, innovasiya layihələrinin maliyyələşdirilməsini həyata keçirirlər. Innovasiyaların maliyyələşdirilməsi üçün təqdim olunan bank kreditlərini aşağıdakı növlərə bölmək olar (http://projects.innovbusiness.ru/content/ document_r_FE10E07E-EA69-4B9F-95FB-EB2CB68FBF1F.html):

1) investisiyaların kreditləşdirilməsi – qeyri-məqsədli kredit üzrə kredit xəttinin verilməsi. Bu zaman vəsaitlərin qaytarılmasının mənbəyi borcalanın layihənin reallaşdırılmasından gəliri ilə birlikdə bütün təsərrüfat fəaliyyətidir;

2) layihə üzrə maliyyələşdirmə - məqsədli kredit üzrə kredit xəttinin verilməsi. Bu zaman kredit üzrə vəsaitlərin qaytarılması mənbəyi layihənin özüdür. qeyd etmək lazımdır ki, layihə üzrə maliyyələşdirmə, adi investisiya üzrə kreditləşdirmədən daha risklidir.

## Nəticə

Yaranmış şəraitdə aqrar sahədə buraxılan məhsulun rəqabət qabiliyyətinin yüksəldilməsi yeni məhsul növlərinin işlənib hazırlanmasını, yüksək keyfiyyət və qiymət üstünlüklərini təmin edə bilən müəssisələrin innovasiya fəaliyyətindən asılıdır. Hər bir müəssisə öz məhsulunu təkmilləşdirməlidir, əks halda o rəqabət üstünlüklərinə malik olmayacaq. Bu isə bazarların itirilməsinə gətirib çıxaracaq. Bu səbəbdən də müəssisə daima kommersiyalaşdırıla biləcək yeni ideyaların, innovasiyaların axtarışındadır.

Azərbaycanda innovasiya proseslərinin ləngiməsinin aşağıdakı səbəblərini göstərmək olar:

– isthsalçıların istehsal fondlarının texniki səviyyəsinin aşağı olması;

– yüksək ixtisaslı mühəndis-txniki və fəhlə işçilərin çatışmaması;

– bəzi rəhbərlərin əlavə risk və məsuliyyətlə bağlı qərarları qəbul etməyi istəməmsi;

– innovasiya tsiklinin əsas elementlərinin, məlumat və elmi-texniki infrastrukturun inkişaf etməməsi;

–innovasiya infrostrukturunun inkişafına qoyulan investissiyanların çatışmaması.

Bu gün qrar sahədə elmi tədqiqatların əsas iistiqamətləri kimi bio və nano texnologiyalar, genetika, mikrobiologiya, resurslara qənaət, aqrar sahənin məlumatlaşdırılması, ekoloji problemlərin həlli, istehsalat və bazarın fəaliyyətinin iqtisadi mexanizminin təkmilləşdirilməsi, aqrar sahədə yeni idarəetmə üsullarının yaradılması və tədbiqi başa düşülür. Bu tədqiqatların aparılması və tədbiqi üçün aqrar istehsalçıların məqalədə göstərilən maliyyə rsurslarına çıxış imkanlarını genişləndirmək, iqtisadi. təşkilatı və sosial xarakterli dövlət tənzimləməsi və dəstəyi mexanizmlərini təkmilləşdirmək lazımdır. Bura ilk növbədə elmi tədqiqatlarına və onların aqrar sahədə tədbiqinə dövlət dəstəyinin həcminin artırılması; səmərəli infrastrukturun formalaşdırılması (xüsusi aqroiqtisadi zonaların, aqrotexnoparkların, məlumat mərkəzlərinin yaradılması və s.); kənd təsərrüfatı istehsalçıları üçün aqroinnovasiyaların olması və istifadə edilməsi imkanları barədə xüsusi milli məlumat və məsləhət sistemlərinin yaradılması; innovasiyaları qəbul və təcrübədə tədbiq edən aqrar sahə mütəxəssislərinin hazırlanması sisteminin formalaşdırılması daxildir.

## References

1. Anna Klimenko “Innovative development of the agricultural sector of the Ukrainian economy”. Progress in Economic Sciences Nr 1(2014)
2. Mamontov V.D., Kojevnikova T.M. Institutional component modernization of the agrarian sphere // Socio-economic phenomena and processes. Tambov, 2012 No 1.
3. Kojevnikova T.M., Belchenko O.A., Kolomeitseva M.A., 2011. No 9.
4. K.P.Koleskov K 60 Financing of innovative projects: textbook / K.I.Kolesov; Nijny Novgorod state tech. University named after R.E.Alekseeva. – N.Novgorod. 2017. – 118 p.
5. I.O.Botkin, L.G.Kim Sources of funding for innovative activity bulletin of Udmurt University 2013. Vol.1
6. https://www.stat.gov.az/s
7. / ed V. M. Anshina, A. A. Dagaeva. Innovation management: concepts, multilevel strategies and mechanisms of innovative development: textbook. manual 3rd ed. M. Delo, 2007. 584 p
8. Chernykh K. S. Sources and instruments of finansing innovative activities of K. S. Chernykh // The New man In Foreign Policy. 2015. – No27 (71). – P. 4-5.
9. Innovative activity. http://center-yf.ru/data/economy/ Innovacionnaya-deyatelnost.php
10. Financing innovative activities ttp://projects.innovbusiness.ru/content/ document_r_FE10E07E-EA69-4B9F-95FB-EB2CB68FBF1F.html
11. Formation of the innovative potential of a trading enterprise in based on franchising. Management of economic systems. Electron. – scientific. journal. – 2011, http://uecs.ru/uecs-32-322011/item/552-2011-08-09-06-39-59
12. M.M.Radko, V.S.Sukhotskaya. Manufactoring innovation is the way increasing the competitiveness of the enterprise. Proceedings of BSTU, 2017, series 5, No 1, p. 56-59
13. Innovation in th eagricultural sector: institutional aspect: monograph / P.T.Sabluk, O.G. Shpikulyak, L.I.Kurilo and others. NSC “Institute of agrarian. Economics”. –K.: NSC “PAE”. 2010. – p. 706
14. Shubravska O., 2010. Innovation of transformation of the agri-food sector of th eeconomy with the help of new trends and changes in reality. Science of th eeconomy and forecasting, Kiv.

**Rəyçi: dos. E.Salahov**

Göndərilib: 26.11.2021 Qəbul edilib: 15.12.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/73/76-80

**Alagöz Nazim qızı Əlixanova**
Azərbaycan Rəssamlıq Akademiyası
alagozalikhanova@gmail.com

# DİZAYNDA LAYİHƏLƏNDİRMƏ ÜSULLARININ VƏ KONSEPSİYALARININ HAZIRLANMASI

**Xülasə**

Məqalədə dizayn incəsənətin bir növü kimi təqdim olunur. Dizayn nəzəriyyəsində incəsənətin və dizaynın nisbəti problemi xüsysu yer tutur. Tədqiqatçılar tərəfindən müxtəlif baxış bucaqları, nəzər nöqtələri ifadə olunur, onların hamısının əsasını hər bir tədqiqatçının özünəməxsus dünyagörüşü təşkil edir. Bu zaman dizayn anlayışına insan dəyərlərinə öz baxışı, mədəniyyətə və texniki tərəqqiyə dair öz münasibəti sərgilənir ki, bu zaman hər bir mütəxəssis malik olduğu peşə təhsilinə və digər fərdi keyfiyyətlərə söykənir. Tədqiqatçıların böyük əksəriyyətinin rəyinə görə, dizayn kütləvi incəsənətin xüsusi bir formasıdır, çünki, incəsənət əsərləri olduğu kimi, dizaynerin ərsəyə gətirdiyi məhsul da bir yaradıcılıq fəaliyyətin nəticəsidir. Layihə-konstruktor fəaliyyətinin müstəqil bir növü olaraq, dizayn öz spesifik xüsusiyyətlərinə malikdir ki, onların mahiyyəti incəsənətin və sənaye istehsalın sintezindən ibarətdir.

***Açar sözlər:*** *dizayn, üsul, layihə, konsepsiya, metod, texnologiya, problem*

## Preparation of design methods and concepts

**Summary**

Design in the article is presented as a form of art. Art in design theory and the problem of design proportions occupies a special place. Different views by researchers angles, points of view are expressed, the basis of all of them each forms the researcher's own worldview. This time to the concept of design his views on human values, his attitude to culture and technical progress It is exhibited that each specialist has a vocational education and other based on individual qualities. According to the vast majority of researchers,

Because design is a special form of mass art, where works of art as well as the product created by the designer is the result of a creative activity. As an independent type of design activity, design has its own specifics Their essence is that of art and industrial production consists of a synthesis.

***Key words:*** *design, method, project, concept, method, technology, problem*

## Giriş

Dizayn istehsal və satış prosesində istifadə olunan bir vasitədir. Onun təsiri və fəaliyyəti, həyata keçirilməsində hər şey qaydasında olduqda müəyyən qüvvəyə daxil olur. Şirkətlərdə bu xidmətlərdən qüsursuz istifadə etmək imkanı yalnız onların inkişafının müəyyən mərhələsində yaranır.

Bu gün şirkətlərin böyük əksəriyyəti effektiv istehsal sistemi yaratmağa müvəffəq olub və onların artıq öz üslubu var.

Dizayn məhsullarının və bütövlükdə ümumi dizaynın sosiallaşması müasir dünyamızda onun əhəmiyyətinin artmasına imkan yaratdı. Bu gün unikal məhsul hesabına öz imicinin formalaşması üçün böyük tələbat var. Loqo artıq məhsula tətbiq olunub, fərqləndirmə (təsnifat, təbəqələşmə) rolunu oynamır.

Dizaynın əsas məqsədi estetika və cəmiyyətin nəcibliyidir. Fəaliyyətə, dizayn funksiyalarına təsir edən unikal, güclü və təsirli amil olmaq şəxsiyyətin yüksəlişinə, özünə və ətrafdakı sosial və təbii dünyaya təkmilləşdirilməsinə diqqət yetirmək üçün izləyir.

Dizaynı sırf mənəvi fəaliyyət formasına aid etmək olmaz. Təyinat - yüksək estetik və funksional xüsusiyyətlərə malikdir, obyektin yaradılmasından ibarətdir. Dizayn sözün həqiqi mənasında maddi və mənəvi fəaliyyət növlərinin sərhədindədir və onun əsas vəzifəsi insanın maddi, eləcə də mənəvi ehtiyaclarını ödəməkdir. Bu bir növ yeni texniki ixtira deyil, dizaynın böyük bir hissəsidir.

Müasir və qabaqcıl üsullar əsasında yeni dizayn formalarını həyata keçirmək də mümkündür və bu, texniki cəhətdən tərəqqiyə aparan sahələrə aid ola bilər. Biliyin inkişafı olmadan - təbiət elmləri, texniki və humanitar elmi biliklərin mövcudluğu da qeyri-mümkün olardı.

## Əsas hissə

Dizayn fəaliyyətinin mahiyyəti dizayn layihəsi yaratmaq üçün istifadə olunan dizayn metoduna çevrilən bilik və bacarıqlar toplusudur. Digər tərəfdən, dizaynerin dünyagörüşü, onun dizayn obyekti və ətraf aləmə baxışları, həmçinin mühüm qarşılıqlı əlaqə və qanunauyğunluqları ümumiləşdirmək, sintez etmək, fərqləndirmək və ayırmaq bacarığıdır. Bu işin əsas məqsədi dizayn konsepsiyasının layihələndirilməsinin ən effektiv üsullarını və inkişafın davamlılığını müəyyən etməkdir.

"Metod" yunan sözü olan "methodos"-dan götürülmüş, "tədqiqat", "dərketmə üsulu", "nəzəriyyə", "idrak" və etibarlılığın praktiki və ya nəzəri cəhətdən dərk edilməsi üçün bu və ya digər problemin həllinə dəstək verəcək üsul və ya əməliyyatların məcmusu deməkdir (2, s.56).

Dizaynda metod və metodologiya anlayışı layihənin məqsədinə nail olmaq qaydası, layihəçi tərəfindən verilən funksional-məkan, texnoloji və bədii tapşırıqlar, arzu olunana nail olmaq üçün zəruri olan üsul və ya əməliyyatların davamlılığını, layihə (dizayn) fəaliyyətinin optimal təşkilinə yönəlmiş tədbirlər sistemini nəzərdə tutur. O, özlüyündə biliklərin və mürəkkəb işlərin bir-biri ilə sıx əlaqəli bir neçə bölməsini ehtiva edir: ən ümumi texnologiyadan ən qabaqcıl və konkret texnologiyaya qədər layihə üzərində işin ardıcıllığını və qaydasını aydınlaşdıran metoddur.

Dizaynda metod və metodologiyanın spesifikliyi layihənin hərəkətlərini praqmatik, eləcə də bədii nəticələr kimi istiqamətləndirmək üçün daxil edilir və ierarxiyanın onlara təlimat vermə prosesinə uyğun olduğunu nəzərə almaqdan irəli gəlir. Bu o deməkdir ki, dizaynerin istifadə etdiyi metod və metodika mühəndislik və bədii yaradıcılıq imkanlarını sintez edən, onun təlim və peşə işinin texnologiyasını əvvəlcədən müəyyən edən elementləri əhatə etməlidir.

Dizayn sahəsində yeni hadisənin yaranması heç vaxt gözlənilməz, idarə olunmayan, təsadüfi hadisə deyil. Dizayn nəzəriyyəsi və təcrübəsi yeni həllərin axtarışının xüsusi texnologiyasını inkişaf etdirdi, onun köməyi ilə prosesi sadələşdirmək və sürətləndirmək mümkün oldu. Bu proses layihədən əvvəl təhlil adlanır. Bu texnologiya universaldır. Ən müxtəlif siniflərin və növlərin layihə tapşırıqları üçün qənaətbəxş və uyğundur (4, s.87).

Ətraf mühitin layihələndirilməsində layihəqabağı təhlilin metodologiyasının mahiyyəti ondan ibarətdir ki, vəziyyətin öyrənilməsi üçün təklif olunan layihələndirmə prosesi işin məqsədlərinə və nəticələrinə uyğun olaraq bir sıra müstəqil mərhələlərə bölünür. Həmin mərhələlər aşağıdakılardır:

1. İcmal, vəziyyət, gələcək obyektin yerləşdiyi kontekst, onun malik olacağı xassələrin siyahısı ilə tanışlıq. Bu mərhələnin qəbulu, analoqların öyrənilməsi, bədii məlumatların və real prototiplərin tədqiqi, onların müsbət və mənfi keyfiyyətlərinin müəyyən edilməsi, gələcək iş qarşısında qoyulan birbaşa vəzifələrin qısa və dəqiq ifadəsini özündə əks etdirir.
2. Tərtibatçı problemi mühüm məsələ kimi mənimsəmək və həyata keçirmək vəzifəsini qarşısına məqsəd kimiqoyur, yəni, obyektin gələcək həyatının aspektləri ilə onun konstruksiyalarının əməliyyat xüsusiyyətləri arasında mövcud ziddiyyətlərin qarşıdurmasını təhlil edir.
3. Problemin ən mühüm məqamlarının nəzərə alındığı xüsusiyyətlərin müqayisəsi, onların ümumi həllinin müxtəlif variantlarına tətbiqi və ən təsirli variantının seçilməsini həyata keçirir. Bu hələ layihə deyil, bu dizayn konsepsiyası, gələcək layihənin əsas dizayn ideyasıdır, lakin o, artıq bu layihənin real formalarına malikdir: mühəndislik, məkan, prosedur və s.

Kompozisiya-təşkilatiliyin bütün variantları, yəni möhürləmə komplekslərinin vəzifələri iki qrupa bölünə bilər:

1) "görünməmiş dizayn" - əvvəllər tədqiq edilməmiş texniki, məkan parametrlərinin sintezi olan əsaslı yeni obyektlərin yaradılması;

2) "prototip" - yeni keyfiyyətlərin xarici növə və ya artıq tanış olan obyekt və sistemlərin texniki həllinə tətbiqi.

Söhbət ətraf mühitin təşkili nöqteyi-nəzərindən özünü tövsiyyə etmiş metodun təkmilləşdirilməsi və müasirləşdirilməsi, işlənib hazırlanmış texniki və ya məkan sxeminin yeni zövqlərə və ya hadisələrə uyğunlaşdırılmasından gedir. Hər iki halda istehlakçının yeni xidmət növü, yeni məhsul, ətraf mühit

üçün yeni həll yolu aldığını söyləmək mümkündür. Amma bu halda layihə fəaliyyətinin xarakteri eyni deyil (3, s.66).

Layihə fəaliyyətində istifadə olunan üsullar "inversiya" metodu vasitəsilə müəyyənləşir. Bu, fəaliyyətin nəzərdən keçirilməsi obyektinin bucağının dəyişdirilməsi hesabına baş verir. Yaradıcılıq məqsədinin dəyişməsi ilə əlaqədar olaraq konstruksiyanın möhkəmliyi deyil, onun hazırlanmasının sadəliyi mühüm amil kimi dəyərləndirilir. Bu, durğun vəziyyətlərin öhdəsindən gəlməyə imkan verir.

Obyektlərə yeni yanaşmalar sayəsində eyni problemlərin əvvəllər məhəl qoymayan həlli indi birinci plana keçə bilər və resurs onu inkar etməyə imkan verəcəkdir. Eyni vəzifələr, obyektin işinin əsl səbəbləri şərti olaraq gözlənilməz qərarlar üsulu ilə həll edilə bilər.

Layihənin problemlərinin öz fraqmentli hərəkətlərinə bölünməsi üçün kifayət yaxşı metod hesab olunur. Burada əldə edilən nəticələr onların bir-birini tamamlayan və bir-birini dəstəkləyən təkliflərini ifadə edir, nəticələr vahid zəncirə çevrilir. Ancaq bu işdə ən vacib məqamlardan biri hadisənin qarşısının alınmasıdır. Bu vəziyyətdə "ağac məqsədləri"nin yaradılması kömək edir. Digər üsullar layihə mədəniyyəti çərçivəsində toplanmış geniş bilik və bacarıq arsenalının yaradıcılıq prosesinə cəlb edilməsinə yönəldilmişdir.

Evristik (yəni, ixtiraçı, açıq) analoqların müxtəlif variantları aşağıdakılardır:

-"subyektiv"- bu halda müəllif özünü şərti seçilmiş personaj kimi hiss edir, məsələn, məşhur uşaq kitabından Karlson;

- "simvolik"-"atəş" və s.;

-"fantastik", onların ortaya çıxdığı, hər hansı bir obyekt və ya hadisə ilə bağlı mümkün olmayan problemlər.

Bütün bu assosiasiyalar və ehtimallar layihə təfəkkürünün stereotiplərini qıraraq, dizayneri "qarşılaşdığı problemlərə, daha doğrusu, müxtəlif köməkçi vasitələrin köməyi ilə xarici metod və prinsiplər tətbiq etməyə məcbur edir. Müəyyən bir bütövlükdə razılaşdırıla bilməyən hissələrin düşünülmüş "birliyi"; vəziyyətin həll olmasına geniş imkanlar açır. Belə çıxır ki, bu üsullar bizim adət etdiyimiz, yəni, müəllif üçün lazım olanı edir, onun fərqli cəhətlərini önə çəkir (6, s.76).

Ətraf mühitin bu üsulla yaradılmış komponentlərinin məkan və ya funksional təşkilində həmişə ətraf mühitin obyekt və sistemlərinin kompozisiya xassələrində bu və ya digər obrazda əks olunur. Biri - kompozisiya elementlərinin gözlənilməz formalarını yaradır və ya onlarıxaric edir, digərləri obyektlərin və kompozisiyanın məkan komponentlərinin yeni birləşmələrini yaradır, bunun nəticəsində müxtəlif bucaqlar altında prosesi və dinamik rəqsləri görməyə imkan yaranır. Lakin qeyd etmək lazımdır ki, istənilən halda bütün bu tapıntılar mahiyyətin yeni obrazlı həllinin müxtəlif variantlarını müəyyən etməyə kömək edir və onlar tamaşaçı üçün qeyri-ənənəvi, gözlənilməz və qeyri-adidir, bu isə heç də həmişə münasib olmur.

Həqiqi metodologiyalar adətən bu və ya digər dərəcədə nəzərdən keçirilən bütün növlərin elementlərini ehtiva edir və bu elementlərin hər biri digər spesifik xüsusiyyətləri zənginləşdirir və tamamlayır. Layihə öncəsi təhlilin ən mühüm komponentlərindən biri dizayn konsepsiyasının - ətraf mühitin əsas kompozisiya strukturunun hazırlanmasıdır.

Layihə fəaliyyətində istifadə olunan üsullar "inversiya" metodu, yəni fəaliyyətin nəzərdən keçirilməsi obyektinin bucağının dəyişdirilməsi hesabına, qiymətləndirilir. Yaradıcılıq məqsədinin dəyişməsi ilə əlaqədar olaraq hesab üçün durğun vəziyyətlərin öhdəsindən gəlməyə imkan verilir. Obyektlərə yeni yanaşmalar sayəsində eyni problemlərin əvvəllər məhəl qoyulmayan həlli indi birinci plana keçə bilər və bu şəkildə açıqlana bilər ki, resurs onu inkar etməyə imkan verəcəkdir. Eyni vəzifələr obyektin işinin əsl səbəblərinin şərti olaraq gözlənilməz qərarlar üsulu ilə həll edilə biləcəyini göstərir. Burada əldə edilən nəticələr onların bir-birini tamamlayan və bir-birini dəstəkləyən təkliflərini ifadə edir, nəticələri vahid zəncirə çevrilir. Ancaq bu işdə ən vacib məqamlardan biri hadisənin qarşısının alınmasıdır. Digər üsullar layihə mədəniyyəti çərçivəsində toplanmış geniş bilik və bacarıq arsenalının yaradıcılıq prosesinə cəlb edilməsinə yönəldilmişdir (4, s.87).

Dizayn konsepsiyası. Dizayn konsepsiyasının yaradılması dizayn işinin müstəqil hissəsidir ki, onun dizayn sənətinin digər növlərində analoqu yoxdur. Layihənin problem vəziyyətini həll etməklə (layihə tapşırığının mövcud ziddiyyətlərinin təsviri), sonra mövzuya görə ("mövzu" - onun mümkün həll yollarının seçimi) gələcək obyektin vahid modelini yaradır. Formaların konseptual əsasda təşkili müəyyən edilmiş mədəniyyət çərçivəsində üslub yaratmaq səviyyəsində bədii dizaynı müəyyən edir və

bu prosesdə üslub xüsusiyyətlərindən şüurlu istifadəyə yeni yanaşmalar hazırlanır. Anlayışın müəyyənləşdirilməsində daha ətraflı araşdırma aparmaq üçün mövzuya işıq salan bir neçə mənbəyə nəzər salmaq lazımdır. İlk öncə bu tərifi fəlsəfi baxımdan dəyərləndirək. Mühüm cəhət müəllifin dünyagörüşüdür.

T.Yu.Bıstrovanın "Əşya.Forma.Üslub:dizayn fəlsəfəsinə giriş" monoqrafiyasında dünyagörüşünün layihə fəaliyyətinə təsiri ətraflı nəzərdən keçirilir. O deyir: "Obyektin bütövlükdə dizaynı müəyyən edilmiş və nəzərdən keçirilmiş nöqteyi-nəzərdən bizə aparıcı konstruktiv prinsipləri və yanaşmaları seçməyə və onların üzərində işləməyə imkan verir. İnteryerin yaradılması prosesində problemi daha dərindən başa düşmək onun maraqlı olmasını təmin edir. İş haqqında uğurlu performans üçün yalnız "intuitiv maarifləndirmə" deyil, səmərəlilik baxımından layihəyə yanaşmaq, əsas ideya, mühüm qarşılıqlı əlaqələr və qanunilik prinsipini seçmək çox vacibdir. Bundan əlavə, unutmaq olmaz ki, bu, həddindən artıq yükləmə deməkdir. Bu, layihənin işləndiyi prosesdir və bu halda ideya işlənməmişdir və istehlakçılar tərəfindən səhv başa düşülə bilər (1, s.78).

Vikipediyada "konsepsiya" termininin təklif olunan tərifi də geniş perspektivlərin vacibliyini vurğulayır. Konsepsiya – "hər hansı bir obyektin, hadisənin və ya prosesin başa düşülməsinin (izahının) müəyyən edilmiş üsulu, obyektə dair əsas nöqteyi-nəzər, onların sistemli inkişafı üçün rəhbər ideyadır". Konsepsiyanın mərkəzində hər hansı bir sahənin sərhəd dəyərlərinin müəyyən edilməsi və maksimum "dünyagörüşünün" həyata keçirilməsi dayanır. Adətən bu, təsisçinin simasında ifadə olunan şəxsiyyətin çox görünən başlanğıcına malikdir.

İlk növbədə, konsepsiya subyektlərin çıxışına onların çıxış prinsiplərini və ilkin şərtlərini daxil edir, əsas anlayışları və əsaslandırma sxemlərini müəyyənləşdirir ki, burada bəyanatın xüsusi təsdiqi edilir. İ.Kollinqvud hesab edirdi ki, konseptual çərçivənin dəyişməsi insanın yaşaya biləcəyindən daha radikaldır, çünki bu, standart inancların daha əvvəl yaranmasının inkarına gətirib çıxarır. Təsvir edilmiş dizayner lüğətində "konsepsiya" anlayışı gələcək obyektin əsas ideyası, obyekti müqayisə ilə layihənin ideoloji-tematik əsası kimi onun mənasının qısa və dəqiq ifadəsi kimi qəbul edilir. Dizayn konsepsiyası gələcək obyektin hazır ideal modelini təmsil edir və bu obyektin əsas xüsusiyyətlərini təsvir edir.

Bir qayda olaraq, dizayn konsepsiyası hər hansı bir paradoksal tezis, gözlənilməz metafora, dizayn təklifinin ən parlaq əks etdirən mənası şəklində qısa və dürüst ifadə edilir.

Bir qayda olaraq, sübut edilmiş prototipləri olmayan və dizaynerin qarşısında duran dizayn sualları, onların həlli üçün funksional texnologiyalar sahəsində, eləcə də dekorativ-plastik tədqiqatlar sahəsində müxtəlif variantlara imkan verir. Buna görə də, bu variantların müqayisəli üstünlüklərini öyrənərək, funksional və estetik problemlərin vəzifələrinin təhlili işığında onların həyata keçirilməsi perspektivlərini nəzərə alaraq, layihənin ideyası kimi dizayn konsepsiyası hazırlanır (3, s.89).

Dizayn konsepsiyası çox böyük obyektlərdə, xüsusən də ətraf mühitdə daha mühüm rol oynayır. Məsələn, M.V.Lomonosova adına MDU-nun bina kompleksi. Bu universitet ölkədə universitet təhsilinin təşkilində mayak olmalıdır - unikallıq və sadəliyin, məqsədlərin davamlılığı və dinamikasının, ənənələrin və innovasiyaların, ünsiyyət azadlığının və qaydalara əməl olunmasının vəhdəti kimi, yəni sistem çoxlu sayda təhsili ifadə edir. ünya səviyyəsində biliyə baxır. Bütün bunlar bu universitet kompleksini digər şəhər strukturları ilə müqayisədə unikal edir, onun formalaşmasının yeni prinsiplərinin işlənib hazırlanmasını tələb edir. Bunun üçün aşağıdakıları həyata keçirmək lazımdır:

- obyektin parametrlərini və xüsusiyyətlərini müəyyən etmək, onu ətraf mühitin müxtəlif tipli komponentlərindən xüsusi qanunla təşkil edilmiş bir sistem kimi təmsil etmək;
- bu və ya digər memarlıq mühitinin memar-dizaynerinin formalaşmasının mümkün yollarını tapmaq;
- bu alətlər toplusunu minimuma endirmək yollarını nəzərdən keçirmək;
- Onların köməyi ilə MDU-nun yeni kompleksinin ideal istehlak xüsusiyyətlərinin formalaşması üçün layihə həlləri qurmaq və bu mühiti sonrakı layihə işlərinin xüsusiyyətlərinə görə fərqlənən alqoritm kimi təqdim etmək. Konsepsiyanın əsas məntiqi bir tərəfi ilə paytaxtda gələcək kompleksin unikallığı, digər tərəfdən isə metafora ilə ifadə olunan "biliklər diyarı"nın və onun nəhəng şəhərinin ətrafının birmənalılığı, fərdiliyidir.

Dizayn-konsepsiya müddəalarının ikinci hissəsi daha çox layihə yönümlüdür və bu və ya digər dizayn həllərinin istəkləri haqqında məlumat verir. Bu konseptual konsepsiyada "firma üsubu"

kompleksi yaradılır, lakin bununla belə, hər hansı bir konkret xidmətin həyata keçirilməsinə dair qərarlar verilir (11, s.89).

Bir sıra layihə təkliflərinin utilitar və texniki əsaslandırılmasının əsası kimi yerli təbii-iqlim şəraitinin makro və mikro səviyyədə uçotu, habelə kompleksin strukturuna yer mühitinin elementlərinin aktiv daxil edilməsi, xüsusi bir atmosfer ümumi texnologiyaların qeyri-dəqiq reproduksiyası vasitəsilə həyatımıza zorakılıqla daxil edilmiş “beynəlxalq üslub”un vizual və sosial stereotiplərinin rədd edilməsi, həmçinin milli kompozisiya və dekorasiya ənənələrinə istinad nəzəzrdə tutulur. Beləliklə, dizayn konsepsiyasının müddəaları struktur təşkilatı vasitəsilə obyektin “ideal” formasının təşkili prosesində həyata keçirilir.

Başqa sözlə, dizayn konsepsiyasının hazırlanmasında eksperimental və ya alternativ dizayn üsullarından geniş istifadə oluna bilməsinə baxmayara, real layihə həlləri bura daxil olmamalıdır. Bu layihələrdə hər hansı illüstrasiyalar təklif edilməlidir. Çünki konkret dizayn layihəsinin hazırlanması, xüsusən də mürəkkəb və ya böyük obyektin dizaynı, hətta bəzi layihələrə dəyər olsa belə, konseptual inkişaf çərçivəsindən kənara çıxan bir sıra müstəqil dizayn hərəkətlərini təmsil edir.

## Nəticə

Beləliklə, müəllifin təkliflərinin yeniliyi və perspektivi, onların sonrakı inkişafının xüsusiyyətləri və hətta qəbulunun taleyi dizayn konsepsiyasından asılıdır. Heç kimə sirr deyil ki, bu tamaşaçı bu sənət əsərinin cəlbediciliyini və praktikliyini yüksək qiymətləndirəcək. Bu məsələnin öyrənilməsi prosesində aydın oldu ki, dizayn metodologiyasına müxtəlif mənbələrdən istinad edilib. Onların əksəriyyəti müxtəlif sənət növlərindən (memarlıq, heykəltəraşlıq, dekorativ-tətbiqi sənət, teatr və kino), eləcə də mühəndisliyin, iqtisadiyyatın, sosiologiyanın, tətbiqi elmlərin müxtəlif sahələrindən götürülmüşdür. Hər bir layihə üçün müəllifin müxtəlif mövcud dizayn üsulları arasından ən uyğun və konkret vəziyyətə uyğun olanı seçmək imkanı var ki, bu da əslində layihənin gələcəkdə inkişafına təsir göstərir. Dizayn metodologiyasını öyrənmək və dizaynda konsepsiyanın inkişaf etdirilməsi vacibdir ki, onlardan öz layihə fəaliyyətlərində səmərəli istifadə olunsun.

## References

1. Irwin J. The concept of "Design" and "Art" // Opinions. 2001, №4, p.160-168
2. Maklakova T.G Architecture of the twelfth century. M.: ASV Publishing House, 2001, 278 p.
3. Lamarck P. Design and trends // The world of design. 2000, №4, p.180-189
4. Kaplun A.I. Design in high school. M.: VNIITE, 1994, 290p.
5. Elochkin ME Introduction to modern design. M.: Knorus, IPR SPO, Elochkin, 2005, 304 p.
6. Design: illustrated dictionary reference book. M.: Архитектура С, 2004, 309 p.
7. Voronov N.V Design: Russian version. -M.; Tyumen: Tyumen College of Arts, 2004, 380 p.
8. Коsкоv M.A. Subject creativity: Firma L.L Icarus, 1996. - Kn.1, ch.I-III, 290 p.
9. Mikhailov SM, Kuleeva LM Basics of design: textbook. -Kazan, 1999, 340 p
10. Runge W. F., Senkovsky V. B. Fundamentals of design theory and methodology: allowance. - M., 2003, 390 p.
11. 11.Lavrent'ev A.H. Design history: textbook. allowance. -M., 2007, 290 p.
12. History of aesthetic thoughts: Formation and development of aesthetics as
13. Science: In 6 vols. T. 3, Europe and America end XVIII - first half XIX century. -M.: Art, 1986, 180 p.
14. Knabe GS Ancient Rome - history and diary: essays / G.C.Knabe. -M.: Art, 1986, 290 p.

**Rəyçi: dos. F.Dadaşov**

Göndərilib: 30.11.2021 Qəbul edilib: 20.12.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/73/81-85

**Sərxan Ənnağı oğlu Qafarov**
Azərbaycan Turizm və Menecment Universiteti
magistrant
qafarov.s@intend.az

# İQTİSADİ ARTIM VƏ İNKİŞAFDA SAHİBKARLIĞIN ROLU VƏ ƏHƏMİYYƏTİ

**Xülasə**

Sahibkarlıq bütün dünyada iqtisadi inkişafın hərəkətverici qüvvəsi olmuşdur. Ədəbiyyata nəzər saldığımız zaman sahibkarlıq anlayışının müxtəlif dövrlərdə bir çox müəlliflər tərəfindən müxtəlif aspektlərdən araşdırıldığı görünür. Aparılan araşdırmaların əksəriyyəti, konsepsiya imkanları görmək, resursları toplamaq və risk etmək kimi məsələlərin müzakirəsi ilə izah olunmağa çalışılıb. Bu məqalədə sahibkarın tərifinə, sahibkarlığın tarixinə və sahibkarın tərkib hissələrinə diqqət yetiriləcəkdir.
***Açar sözlər:*** *Sahibkarlıq, innovasiya, komponenetlər, müasir dövr, iqtisadiyyat*

## Economic growth and development the role and importance of entrepreneurship

**Summary**

Entrepreneurship has been the driving force of economic development around the world. When we look at the literature, it seems that the concept of entrepreneurship has been studied from different aspects by many authors at different times. Much of the research has been done by discussing issues such as seeing the possibilities of the concept, gathering resources, and taking risks. This article will focus on the definition of an entrepreneur, the history of entrepreneurship and the components of entrepreneurship.
***Key words:*** *Entrepreneurship, innovation, components, modern times, economy*

Sahibkar sözünün mənşəyi kimi baxdıqda, latın “intare” sözündən əmələ gəlir; Bu, fransızca “öhdəliyə götürmək, öhdəsinə götürmək” mənasını verən “entreprendre” və ilk başlamaq mənasını verən “sahibkar” sözündəndir. Orta əsrlərdə “fəal, işgüzar” mənasında da işlənmişdir. Hər hansı bir ehtiyacı ödəmək üçün əmək, kapital və təbii ehtiyatlar kimi istehsal amillərini bir araya gətirərək iqtisadi mal və ya xidmət istehsalını həyata keçirən, bu məqsədlə istehsal prosesini layihələndirən və təşkil edən, bütün riskləri öz üzərinə götürən şəxs kimi təyin edilə bilər. Sahibkar ehtiyacları ödəmək üçün təşəbbüs göstərən şəxsdir. Sahibkar risk və qeyri-müəyyənlik mühitində yeni məhsullar və ya iş imkanları istehsal edə bilən, qazancını artırmaq və böyümək üçün imkan və resurslardan istifadə edə bilən şəxs kimi də ifadə edilə bilər.

Sahibkarlar təkcə maddi və ya mənəvi statuslarını yüksəltmək deyil, həm də iqtisadi dəyər və gəlir yaratmaq məqsədi güdürlər. Verilən bütün təriflərdə ortaq məqam sahibkarın “başqalarının baxdığı, lakin görmədiyi imkanları görüb onları biznes ideyasına və qazanc əldə etməsinə” çevirməsi və “riskə meylli olması”dır.

İnsanoğlu tarixin ilk illərindən yaşamaq və ehtiyaclarını ödəmək üçün ovçuluq, əkinçilik, heyvandarlıq və barter ticarəti ilə məşğul olmuşdur. Biz bunu və buna bənzər hər hansı fəaliyyəti sadəcə sahibkarlıq kimi təsvir edə bilərik. Əslində, ibtidai insanlar yaşamaq üçün riskə gedir, fərq qoyur, yeniliklər edir, həyatlarını təhlükəyə atırdılar, yəni bu gün sahibkarlığın təriflərində ortaya çıxan bütün xüsusiyyətləri özündə ehtiva edirdilər (İbrahimov İ.H.: 2010. s. 63.).

Sahibkarlıq istehsalın hər bir dövründə müxtəlif formalarda mövcud olmuşdur. Məsələn, erkən insanlar ov edərkən və ya yığarkən müəyyən istehsal amillərini birləşdirərək son məhsula çatmaq üçün müxtəlif risklər götürürdülər. O günlərdən bu günə qədər sahibkarlıq demək olar ki, hər bir dövrdə sosial-iqtisadi dəyişikliklərlə müxtəlif formalarda mövcud olmuş və müəyyənləşmişdir. Sahibkarlıq, bizim bu gün dərk etdiyimiz kimi, sənaye inqilabı ilə ortaya çıxmış və bu günə qədər elm adamları tərəfindən müxtəlif şəkildə müəyyən edilmişdir (İmanov Ə.Ş: 2009. s. 72.).

XVII əsrdə milli təsərrüfatların yaranması, güclü xəzinələrə ehtiyacın yaranması, sənaye və ticarətə qoyulan məhdudiyyətlərin aradan qaldırılması sahibkarlıq anlayışının fərqli formada meydana çıxmasına səbəb oldu. Bu anlayışdan ilk dəfə istifadə edən Riçard Kantillonun fikrincə, fermer həm də sahibkardır və torpağı müəyyən şəkildə becərməklə gəlir gətirir, sərvət yaradır. Bu dövrdə sahibkara müəyyən məhsul istehsal etmək və ya xidmət göstərmək üçün yerli hökumətlə müqavilə bağlayan insanlar kimi baxılırdı (Manafov Q.N: 2011. s. 77.). Əslində, Fransa hökumətinin bir çox ictimai binalarını tikən fransız iş adamı Con Lounun əsərinə əsaslanan R.Kantillon, sahibkarları qayıdışın qeyri-müəyyən olduğu, lakin geri dönüşün qeyri-müəyyən olduğu situasiyalarda ehtiyatlı və özünə inamla hərəkət edən fərdlər kimi görürdü. Müqavilələrdə əmək haqqı və ya qiymətlər ümumiyyətlə işin sonuna qədər müəyyən edildiyindən müqavilə bağlayan sahibkar öz fəaliyyəti nəticəsində yarana biləcək mənfəət və zərəri də öz üzərinə götürmüşdür. Risk anlayışı ilk dəfə bu dövrdə sahibkarlıq anlayışında ortaya çıxdı ki, bu da bir xidmət göstərmək və ya vəd edilmiş əmtəə istehsal etmək üçün rəhbərliklə müqavilə bağlamaq kimi müəyyən edilir.

R.Kantilyonun fikrincə, fiziki şəxs öz əməyini muzdla işə götürmür və ya işlətmirsə, sahibkardır. Sahibkarı və əmək haqqı ilə işləyən fərdləri fərqləndirən xüsusiyyət ondan ibarətdir ki, sahibkar qeyri-müəyyənlik şəraitində öz vəsaiti ilə işləyərək yaşayıb qazanır. Kantilona görə, sahibkar adətən tanış olmayan və ya qeyri-müəyyən bazar şəraitində spekulyativ fəaliyyətlə məşğul olur. Bu xüsusiyyəti ilə o, sahibkarlıq kapitalı tapan, riskə gedən bir insan kimi də diqqət çəkib. Sahibkarı bu davranışa sövq edən səbəb onun fəaliyyəti müqabilində əldə etməyi ümid etdiyi qazancdır.Xammal, yardımçı və istehlak mallarının qiymətlərindəki dalğalanmaların gözlənilməzliyi səbəbindən bu mənfəət qeyri-müəyyəndir.

XVIII əsrdə dövlətin iqtisadiyyata müdaxiləsinin azaldığı, fərdiyyətçiliyin və xüsusi mülkiyyətin inkişaf etdiyi bir mühitdə Jan Baptiste Say belə bir fikir irəli sürdü ki, sahibkar istehsal amillərini birləşdirərək istehsalın və sərvətin bölüşdürülməsində tənzimləyici rol oynayır. təsərrüfat fəaliyyətinin əsasını təşkil edir. Sahibkarlığın qazancı olan mənfəət sahibkarlıq və idarəetmə (inzibati) funksiyalarını bir-birindən ayırırdı. O, istehsalın yaxşı və ya bədbəxtliyi əvvəlcədən qəbul etməklə meydana gəldiyini müdafiə edirdi.

XX əsrdə azad bazar iqtisadiyyatının inkişafı ilə bu dəfə Cozef A.Şumpeter iqtisadiyyatda dəyişiklik yaradan əsas amilin innovasiya olması fikrini irəli sürərək sahibkarın əhəmiyyətini daha da artırdı. C.A.Şumpeter 1910-cu ildə nəşr etdirdiyi "İqtisadi İnkişaf Nəzəriyyəsi" adlı əsərində sahibkarların innovasiyaları mənimsəməkdə müəssisə və ya biznesi idarə edənlərdən fərqli olduğunu və buna görə də iqtisadiyyatda sərvət yaradan və bölüşdürən mühüm aktor olduğunu bildirdi (Islam, A: 2015. s. 109.).

Sahibkarın cəmiyyətin cari və mümkün ehtiyaclarını müəyyən edərək öz intuisiyasına və təcrübəsinə əsaslanaraq gələcəyə yönəlik qərarlar verməsi onun gələcəyə baxan şəxsiyyətinin göstəricisidir. Davranış baxımından sahibkarlıq anlayışını fürsətdən istifadə etmək, biznes ideyasını müəyyənləşdirmək, lazımi resursları tapmaq, sonra bu təşəbbüsü hərəkətə keçirmək, həyata keçirmək və nəticə əldə etmək üçün zəruri olan bütün fəaliyyətlər kimi müəyyən etmək olar. Sahibkar haqqında verilən təriflərdə dörd əsas elementə diqqət çəkilir. Sahibkarlar öz yenilikləri ilə bazarda yeni tələblər yaradır və bu, mövcud bazarı dəyişdirərək yeni strukturun formalaşmasına gətirib çıxarır. Şumpeter bu vəziyyəti “yaradıcı dağıdıcılıq” adlandırır. Dinamik bir prosesi ifadə edən bu anlayış iyirminci əsrin böyük hissəsində hökmranlığını davam etdirdi. İqtisadi bir quruluşda sahibkarlığı və sahibkarları görməzlikdən gəlməyin mümkün olmadığını ifadə edən Şumpeter, yeni bir kommersiya malının və xidmətinin ortaya çıxması üçün bir ixtiradan istifadə kimi təyin etdiyi “innovasiya” anlayışından əsas güc kimi istifadə etdi. yeni tələbat yaratmaq və bununla da rifah yaratmaq. Beləliklə, sahibkar yenilik etməklə mövcud durğun iqtisadi nizamı məhv edir, innovasiya və investisiyaları işə salır və bununla da iqtisadiyyatı irəli aparır. Bu baxımdan sahibkarlar innovasiya və investisiya güclərindən istifadə edərək yeni bizneslər quran, müxtəlif məhsullar istehsal edən və məşğulluq yaradan idarəçilərdir.

Şumpeter iddia edir ki, həm sahibkarlar, həm də menecerlər risk alır, lakin innovasiyalar sahibkarlar üçün əsas fərqləndirici amil olacaq. Onun sözlərinə görə, sahibkarların ən mühüm problemi yeni ideyalar tapmaq və bu ideyalardan istehsalatda istifadə etməkdir. Başqa sözlə, o, bunları yeni məhsul və xidmətlərin inkişafı, yeni istehsal üsullarının inkişafı, yeni bazarların tapılması, yeni təchizat mənbələrinin kəşfi və yeni təşkilat formalarının inkişafı kimi sadalayır. Müasir sahibkarlıq düşüncəsinin

